# DƏVƏT İMAMLARININ
*(Allah onlara rəhmət etsin)*
# MÜƏYYƏN İNSANA HÜCCƏT ÇATDIRMAQ HAQQINDA SÖZLƏRİ

*Toplayan:*
Rəşid ibn Əhməd Uveyyiş

Tərcümə edən:
Rahim Muradlı

# Mərhəmətli və rəhmli Allahın adı ilə

Həqiqətən həmd Allaha məxsusdur. Biz Ona həmd edir, Ondan yardım və günahlarımızın bağışlamasını diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allahın doğru yola yönəltdiyi kimsəni azdıran, azdırdığı kimsəni isə doğru yola yönəldən tapılmaz.

Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur. O, təkdir və şəriki yoxdur. Mən şahidlik edirəm ki, Məhəmməd Onun qulu və elçisidir.

***"Ey iman gətirənlər! Allahdan layiqincə qorxun. Yalnız müsəlman olduğunuz halda (*müsəlman kimi*) ölün!"*** *(Ali-Imran,102)*

***"Ey insanlar! Sizi tək bir şəxsdən (*Adəmdən*) xəlq edən, ondan zövcəsini (*Həvvanı*) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun! (*Adı ilə*) bir-birinizdən (*cürbəcür şeylər*) istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən həzər edin! Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!"*** *(ən-Nisa,1)*

***"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin! (*Əgər belə etsəniz, Allah*) əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə (*Cənnətə*) nail olar."*** *(əl-Əhzab,70-71)*

***"Həqiqətən, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Məhəmmədin*** (*ona Allahın salavatı və salamı olsun!*) ***yoludur. Əməllərin ən pisi isə sonradan uydurulanlardır. Sonradan uydurulub dinə gətirilən hər əməl bidət, hər bidət yolundan sapma və sapma da cəhənnəmlikdir"***[*].

Müəyyən insanı təkfir etmək İslam ümmətinin səhabələrin dövründən bu günümüzə qədər yaşadığı ən təhlükəli məsələlərdəndir. Raşidi xəlifə Osman ibn Əffanın xilafətinin ilk vaxtlarında və eləcə də Əli ibn Əbu Talibin xilafətində xarici *(xəvariclər)* firqəsi meydana çıxdı. Bu firqə adı çəkilən xəlifələrə kafir deyir, onlara qarşı zülm və ədavətlə döyüşürdülər. Onlar Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) səhabələrini, bu xəlifələrə dəstək olan müsəlmanları kafir sayır, hətta onları qətlə yetirirdilər.

Xaricilər *(xəvariclər)* firqəsi zühur etdikdən sonra bu günə qədər müxtəlif təriqətlər zühur etməkdədir. Sələfi salehin davamçıları sayılan Əhli Sünnə və Camaatı Allah təala haqq yola yönəltmiş və onları bu yolun yolçusu olmağa müvəffəq etmişdir. Onlar dində ifrata varanlarla ona laqeydlik göstərənlər arasında orta bir mövqe tutmuşlar. Xaricilər *(xəvariclər)* firqəsi öz təhlükəli əqidəsini müsəlmanlara kafir demək metodu əsasında qurmuşlar. Səhabələrin vaxtından bu günə qədər haqq tərəfdarı olan bir çox İslam alimləri onların əqidələrinin batil olmasını şəriətin açıq-aşkar dəlilləri ilə isbat etmişlər. Haqq tərəfdarı olan alimlərə nümunə olaraq, başda Şeyxülislam Məhəmməd ibn Əbdülvahhab ət-Təmimi[1] *(Allah ona rəhmət etsin)* olmaqla bütün dəvət imamlarını göstərmək olar. Onlar müəyyən insana kafir demək barədə öz metodlarını açıqlamış və bu xüsusda Sələfi Salehin metodunda olduqlarını bildirmişlər. Elmi mənbələrimin qıtlığı səbəbindən, tam olmasa da bacardığım qədər *"Müəyyən insana kafir demədən öncə ona hüccətin çatdırılması"*nın vacibliyi haqqında bu alimlərin bəzi sözlərini toplamışam. Bu mövzuda onların otuzdan çox sözünü qeyd etmişəm. Düşünürəm ki, bu sitatlar dəvət imamlarının sözlərini səhv başa

---

[*] Muslim (867), Nəsai, (3/188).

[1] Əqidət əş-Şeyx Məhəmməd ibn Əbdülvahhab əs-Sələfiyyə və Əsəruhə fil Aləm əl-İslami (Şeyx, Saleh əl-Əbud).

düşən qardaşlarımızı *(Allah bizim hamımızı bağışlasın)* qane edəcəkdir. Daha sonra yekun olaraq hüccəti başa düşməyin *(Fəhmul Hüccət)* şərt olması məsələsi haqqında doğru rəyi qeyd edib, Məhəmməd ibn Əbdülvahhab və digər dəvət imamlarının hüccəti başa düşməyi bir şərt olaraq qəbul etdiklərini, əvvəlki alimlərin yolu ilə getdiklərini açıqlamışam. Məhəmməd Rəşid Ridanın, Şeyx Əbu Bətinin *(Allah ona rəhmət etsin)* sözünə gətirdiyi açıqlamanı da qeyd etmişəm. Bu açıqlama ilə məsələnin bir çox qaranlıq tərəfi açıqlanır, hədis və elm tədqiqatçıları sayılan alimlərin metoduna əsasən hüccətin çatdırılması ilə bərabər onun başa düşülməsi mütləq lazımdır.

Məni, alimlərin sözlərini toplamağa sövq edən amil bu alimləri müdafiə etməkdir. Belə ki, onların öz etiqadlarını kitablarından bəyan etmələrinə baxmayaraq, yenə də etiqad etmədikləri məsələlər onlara nisbət edilmişdir.

Əzəmətli Ərşin Rəbbi Allahdan istəyirəm ki, bu yazdıqlarımı mübarək və sırf Onun rizası üçün edilən əməl kimi qəbul etsin, bunu həmin alimlərin müdafiəsinə yazsın.

Qeyd: mötərizə arasında olan qeydlər mənim öz sözlərimdəndir.

PDF...

# DƏVƏT İMAMLARININ
## *(Allah onlara rəhmət etsin)*
# MÜƏYYƏN İNSANA HÜCCƏT ÇATDIRMAQ HAQQINDA SÖZLƏRİ

(İmam əl-Mücəddid Şeyxülislam Məhəmməd ibn Əbdülvahhab ət-Təmimi *(Allah ona rəhmət etsin)* öz əqidəsini açıqlayarkən demişdir):

1. "Kiməsə kafir demək məsələsinə gəldikdə mən o kəsə kafir deyirəm ki, o Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) dinini bilsin, bildikdən sonra onu söysün, insanları bu dindən yayındırsın, bu dinə əməl edənlərə qarşı ədavət göstərsin. Bax mən bu insanlara kafir deyirəm. Allaha şükürlər olsun ki, İslam ümmətinin əksəriyyəti belə deyildir"[2].

Həmçinin digər bir məqamda demişdir:

2. "Bu gün baş verən bəzi hallara, Peyğəmbərlərdən, övliyalardan kömək diləmək, öldükdən sonra şəfaət istəmək, qəbirləri üzərində qübbələr tikib, ətrafında şam yandırmaqla təzim etmək, qəbirlər qarşısında namaz qılmaq, ziyarətgaha çevirmək, bu yerlərə qurban və nəzir demək və s. bütün bunlar dinə əlavə edilmiş yeniliklərdir. Artıq Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* bunların baş verəcəyi haqda xəbərdarlıq edərək, müsəlmanları bu işlərdən çəkindirmişdir. Belə ki, hədisdə deyilir: "***Ümmətimdən bir dəstə insan müşriklərə yetişmədikcə, bütlərə ibadət etmədikcə Qiyamət qopan deyil***". Beləliklə Peyğəmbər (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) hər zaman tövhidin aliliyini ən yüksək dərəcədə mühafizə etmiş, şirkə yol açan hər bir səbəbin qarşısını alaraq qəbirlərin ucaldılmasını və üzərində qübbə tikməyi qadağan etmişdir. Belə ki, Müslimin səhih əsərində Cabirdən bu haqda hədis nəql edilmişdir. Həmçinin adı çəkilən kitabda deyilir ki, Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* Əli ibn Əbu Talibi *(Allah ondan razı olsun)* qarşılaşdığı hər bir hündür qəbri yerlə bərabər etməyə göndərmiş və qəbirlərin üzərində həkk edilmiş şəkilləri silməyi ona tapşırmışdı. Elə buna görə də alimlər demişlər ki, qəbirlər üzərində inşa edilən qübbələri mütləq dağıtmaq lazımdır. Çünki bu qübbələr Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* şəriətinə müxalif olaraq inşa edilmişdir. Bax elə bu məsələ bizimlə qarşı tərəf arasında ixtilafa səbəb olmuşdur. İş o yerə gəlib çatıb ki, onlar bizə kafir deyir, bizə qarşı vuruşur, qanımızı və malımızı halal görürlər. Nəhayət, Allah bizi onların üzərində qalib etdi. Bax biz insanları bu əqidəyə dəvət edir, onlara Allahın, rəsulunun və sələf alimlərinin yekdil rəyindən **hüccət *(tutarlı dəlil və sübutlarla haqqı)*** çatdırdıqdan sonra Allahın bu ayəsini əsas tutaraq: *"(Yer üzündə) fitnə (şirk) qalmayıb, bütün din (ibadət) yalnız Allaha məxsus olanadək onlarla vuruşun..."*[3] onalarla vuruşuruq. Kim bu dəvəti söz və açıqlama ilə qəbul etmirsə onlara qarşı qılıncla döyüşürük. Belə ki, Allah təala buyurur: "**And olsun ki, Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə *(möcüzələrlə)* göndərdik. Biz onlara birlikdə *(Allahın hökmlərini bildirən səmavi)* kitab və ədalət tərəzisi *(şəriət)* nazil etdik ki, insanlar *(bir-biri ilə)* ədalətlə rəftar etsinlər. Biz həddindən artıq möhkəm olan və insanlara fayda verən dəmiri də icad *(nazil)* etdik *(mədənlərdən çıxartdıq)* ki, Allah *(Özünü)* görmədən Ona *(onun dininə)* və**

[2] əd-Dürər əs-Səniyyə: 1, 73.

[3] əl-Ənfal: 39

**peyğəmbərlərinə kömək göstərənləri** ***(dəmirdən düzəlmiş silahlarla kafirlərə qarşı vuruşan mücahidləri)*** **bəlli etsin. Həqiqətən, Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir![4]"[5].**

(Yəmən vilayətinin başçısı Məhəmməd ibn Əbdülvahhaba məktub yazıb onun haqqında eşitdiklərini dəqiqləşdirərkən belə bir məqama toxunur): Mən eşitmişəm ki, sən ümumi olaraq hamıya kafir deyir, əməlisaleh insanları dinləmir, son əsrlərdə yaşayan alimlərin kitablarına əməl etmirsən. Sən mənə bu deyilənlər, öz əqidən və insanları hansı əqidəyə dəvət etməyin haqda doğru məlumat ver ki, sənə qarşı olan sevgimiz və inamımız qalsın.

(Şeyx Yəmən vilayətinin başçısına yazıb bildirir):

3. "Mənim ümumi şəkildə camaata kafir deməyim haqqında deyilənlər, bu dinin yayılmasının qarşısını almaq istəyən düşmənlərin bir böhtanıdır. "**…Aman** ***(Allah)*****! Bu, çox böyük bir böhtandır!...**"[6]"[7].

Digər bir məqamda Şeyx Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* soruşulur: Hansı əsasa görə insanlara qarşı savaşmaq və müəyyən bir nəfərə kafir demək olar? Cavabında deyir:

4. " İslamın beş şərtinə *(əməl edilməsinə)* görə *(insanlarla)* savaş etmək olar. Bunların ən önəmlisi Şəhadət kəlməsi, daha sonra isə İslamın digər dörd əsasıdır. Əgər kimsə digər dörd əsası iqrar *(təsdiq)* edib səhlənkarlıq üzündən onları tərk edərsə biz onun bu dörd əsası icra etməsi üçün ona qarşı düyüşsək də, onun bu əməlləri tərk etməsindən dolayı onu kafir saymırıq. Alimlər bu dörd ərkanı inkar etməkdən deyil, tənbəllik üzündən tərk edənin hökmündə ixtilaf etmişlər. Biz yalnız alimlərin ittifaq etdikləri məsələlərə görə kiməsə kafir deyirik. Bu da şəhadət kəlməsidir. Həmçinin biz şəhadət barəsində kiməsə haqqı bəyan etdikdən sonra onu inkar edəni kafir sayırıq.

Bu əsasla deyə bilərik ki, bizim düşmənlərimiz dörd qismdir:

**Birinci qism:** Bizim dəvət etdiyimiz tövhidin Allahın və Peyğəmbərinin dini olduğunu bilib, bu gün çox insanların etiqadı sayılan ağaclara, daşlara, insanlara sitayiş etməyin Allaha şərik qoşmaq olduğunu təsdiq edib, Allah təalanın öz rəsulunu bu kimi əməlləri qadağan etmək üçün göndərdiyini və hər yerdə Allaha ibadət olunana qədər belə əməl sahiblərinə qarşı döyüşməyi əmr etdiyini dərk edib sonra tövhidə və onu öyrənməyə heç bir məhəl qoymayan, ona riayət etməyən və şirkdən əl çəkməyən kimsə kafirdir və biz onun bu küfrünə görə ona qarşı döyüşürük. Çünki bu insan, Peyğəmbərin dininə və ona riayət edənlərə nifrət etməməsinə, şirki tərifləməməsinə və insanları ona təşviq etməməsinə baxmayaraq, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* dinini bilib ona itaət etmədiyi, şirkin nə olduğunu bilib ondan əl çəkmədiyi üçün kafirdir.

**İkinci qism:** Haqqı bilib ona əməl etdiyini iddia etdikdən sonra Peyğəmbərin dinini söyən, Yusifə, Əşqərə, Əbu Əliyə, Kuveyt əhlindən olan Xızıra ibadət edənləri tərifləyən, belələrini şirki tərk edən və Allahı tək tutanlardan üstün sayarsa bu insan birinci qismdən daha pisdir. Bu haqda Allah təala buyurur: "**…Bildikləri (peyğəmbər) gəldikdə isə, (paxıllıq edib) ona inanmadılar. Allah kafirlərə lənət eləsin!**"[8] Belələri haqda Uca Allah buyurur: "**Əgər əhd bağladıqdan sonra andlarını pozsalar və dininizi yamanlayıb təhqir**

[4] əl-Hədid: 25
[5] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 87.
[6] ən-Nur: 16
[7] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 99-100
[8] əl-Bəqərə: 89

**etsələr,** ***(sözlərinin üstündə durmayan)*** **küfr başçıları ilə vuruşun. Onların həqiqətdə andları** ***(əhdləri)*** **yoxdur** ***(onlar üçün heç bir andın, əhdin əhəmiyyəti yoxdur)*****. Bəlkə,** ***(bu yaramaz işlərdən)*** **əl çəkələr!"**[9]

**Üçüncü qism:** Tövhidi bilib, onu sevib və ona əməl edib, həmçinin şirki bilib və ondan uzaq olub, amma tövhidi qəbul edənlərə nifrət edib, şirk içində qalanları xoşlayan insan da kafirdir. Belələri haqqında Allah təalə buyurur: "**Bu ona görədir ki,** ***(kafirlər)*** **Allahın nazil etdiyini** ***(Quranı)*** **bəyənmədilər,** ***(Allah da)*** **onların əməllərini puç etdi."**[10]

**Dördüncü qism:** Bütün deyilənlərdən salamatdır. Lakin ölkəsinin əhalisi tövhid əhlinə qarşı açıq-aşkar ədavət göstərir, şirk edənlərə tabe olur və tövhid əhlinə qarşı döyüşürlər. Belə halda həmin adam ölkəsini tərk etməyin çətin olduğunu üzür gətirib onlarla birlikdə tövhid əhlinə qarşı döyüşür, malı və canı ilə bu işə can atır. Bu insan da kafirdir. Əgər bu adama öz ölkəsində oruc tutmağı qadağan etsələr və çıxış yolu olaraq öz ölkəsini tərk etmək məcburiyyətində qalarsa, o bunu mütləq edər. Həmçinin ona öz ölkəsində atasının arvadı ilə evlənməyi əmr etsələr və çıxış yolu olaraq öz ölkəsini tərk etmək məcburiyyətində qalarsa, o bunu mütləq edər. Belə bir insanın Allah və rəsulunun dinini boğmağa çalışan bir ölkə ilə tövhid əhlinə qarşı canı və malı döyüşməsi yuxarıda deyilən haldan daha acınacaqlıdır. Təbii ki, belə insan da kafirdir. Allah təalə belələri haqqında buyurur: "**Siz elə kəslərə də rast gələcəksiniz ki, onlar həm sizdən, həm də öz camaatından arxayın olmaq istərlər.** ***(Sizin yanınızda özlərini müsəlman kimi, qəbilələrinə qayıtdıqda isə kafir kimi aparırlar)*****. Bunlar da hər dəfə fitnə-fəsad törətməyə sövq edildikdə başıaşağı ora atılarlar** ***(cani-dildən bu işə qoşularlar)*****. Əgər onlar sizi tərk edib getməsələr, sülh təklif etməsələr və sizdən əl çəkməsələr, onda onlara harada rast gəlsəniz, tutub öldürün. Biz onların əleyhinə çıxmaq üçün sizə açıq fərman verdik"**[11]**.** Bax bizim dediklərimiz budur.

Bizə qarşı atılan yalan və böhtanlara gəldikdə isə onlar deyirlər ki, guya biz ümumi şəkildə camaata kafir deyir, *(digər ölkələrdə)* yaşayıb dinini rahat şəkildə yaşayanların bizim torpaqlara hicrət *(köç)* etməsini vacib sayır, kiməsə kafir deməyəni kafir sayır, döyüşlərdə iştirak etməyənləri kafir sayırıq və s. bu kimi məlumatlar yalandır, böhtandır. Bu söz-söhbətləri yayanlar bununla insanları Allahın və rəsulunun dinindən yayındırmaq istəyirlər.

Biz, cahilliyi və bixəbər olması[12] ucbatından Əbdülqadirin, Əhməd əl-Bədəvinin və bu kimi qəbirlərin üzərində ucaldılan bütlərə ibadət edənlərə kafir demirik. Necə ola bilər ki, bizim torpaqlara hicrət *(köç)* etməyən, kiməsə kafir deməyən, döyüşlərdə iştirak etməyən Allaha şərik qoşmayan insanlara kafir deyək?! "**…Aman** ***(Allah)*****! Bu, çox böyük bir böhtandır!..."**[13]

Biz əvvəldə dediyimiz o dörd qism insanlara kafir deyirik. Çünki onlar *(öz əməlləri ilə)* Allaha və rəsuluna qarşı çıxırlar. Özünə diqqət edib, cənnət və cəhənnəm sahibi olan

---

[9] ət-Tövbə: 12
[10] Məhəmməd: 9
[11] ən-Nisa: 91
[12] Şeyx İbrahim ibn Amir ər-Ruheyli "Movqifi əhlissünnə vəl camaat min əhlil əhva vəl bidə" *(Əhli sünnə və camaatın bidət və nəfsi istəklərinə uyanlara münasibəti)* adlı kitabı 1/218-də deyir: "Bu kitabın bəzi nüsxələrində *(və adəmi mən yufəhhiməhum)* ***(onları başa salanların olmamasına görə)*** deyilir. *(Bax, Əbu Batinin nüsxəsi)*. Bu məqamı Şeyx Saleh əl-Ətram və Şeyx Məhəmməd əd-Duveyş kitabın tədqiqatında qeyd etmişlər",
[13] ən-Nur: 16

PDF...
Allahı xatırlayan insanı Allah bağışlasın. Son duamız Məhəmmədə, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun deməkdir"[14].

(Şeyx Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* Əhməd ibn Əbdülkərimə göndərdiyi məktubunda deyir):

5. Şeyxin[15] bu sözlərini sənə yalnış çatdırmaqla daha pis iş tutblar. Əgər biz sizin dediyiniz fikirdə olsaydıq o zaman bir çox məşhur insanları fərdi şəkildə kafir sayardıq. Lakin şeyx orada qeyd edir ki, müəyyən insana hüccət ***(Qurandan, sünnədən və sələfin sözlərindən tutarlı dəlil və sübutlarla haqq)*** çatdırılmadan kafir deyilmir.

Fərdi insan hüccət çatmamış kafir olmur. Lakin bu o demək deyil ki, o insan Allah və rəsulunun sözlərini Əbu Bəkrin *(Allah ondan razı olsun)* anladığı kimi başa düşməlidir. Kimə Allah və rəsulunun kəlamı yetişər və o insana üzr yeri qalmasa o kafir sayılar. Elə əvvəllər bütün kafirlərə Quranla hüccət çatırdı[16]. Bu haqda Allah təala buyurur: "**Lakin onu *(Quranı)* başa düşməsinlər deyə, onların ürəklərinə pərdə çəkdik ...**"[17], "**Allah yanında *(yer üzündə)* gəzən canlıların ən pisi *(haqqı)* dərk etməyən karlar və lallardır**[18]"[19].

**(Əbdürrəhman ibn Həsən, hüccətin çatdırılması məsələsində Şeyxülislam Məhəmməd ibn Əbdülvahhabın mənhəcini bəyan edərək deyir):**

6. "Şeyximiz, Şeyxülislam Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* deyir: *(əş-Şərif adlı bir nəfər)* məndən insanlara qarşı hansı əsasla döyüşməyimizi və onlara kafir deməyimizi soruşur? Şeyx deyir: Biz yalnız alimlərin yekdilliklə *(hansısa əməlin insanı islamdan çıxaran küfr olması haqqında)* razılaşdıqları məsələlər əsasında kiməsə kafir deyirik. Alimlərin yekdilliklə *(insanı islamdan çıxaran küfr olması haqqında)* razılaşdıqları məsələ isə Kəlmeyi Şəhadəti başa düşdükdən sonra onu inkar etməkdir"[20].

(Şeyx Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* Məhəmməd ibn Eydə göndərdiyi məktubunda deyir):

7. "Bilin ki, mən sizə dörd məsələ haqqında artıq məlumat vermişəm. *(Sonra şeyx bu dörd məsələnin üçüncüsündə deyir)*: Bizim dəvət etdiyimiz tövhidin Allahın və Peyğəmbərinin dini olduğunu bilən, sonra ona nifrət edib insanları ondan uzaqlaşdıran, Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) yoluna tabe olanlara qarşı döyüşən, Allaha şərik qoşmağın mahiyyətini bilən, Allahın öz Peyğəmbərini şirki qadağan etmək üçün göndərdiyini dərk edən, gecə-gündüz bu deyilənlərin haqq olduğunu haray çəkən, daha sonra isə şirki tərifləyib, insanları ona təşviq edib, öz tərəfində olanların çoxluğuna görə onların haqq olduğlarını iddia edən kimsə kafirdir.

---

[14] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 102-104

[15] Burada şeyx deməklə, Şeyxülislam ibn Teymiyyəni *(Allah ona rəhmət etsin)* nəzərdə tutur.

[16] Heç kəs şeyxin bu sözlərində elə başa düşməsin ki, Allahdan başqasına ibadət edən insan sadəcə Quranı oxumaqla ona hüccət çatmış sayılır. Xeyr, bu əsla belə deyildir. Şeyxin sözü, Qureyş kafirlərinin Quranı başa düşdükləri kimi anlayanlara aiddir. Çünki Quran onların dilində nazil olmuşdu. Amma bizim əsrimizdə isə cəhalət çoxaldığından, elm və alimlər azaldığından insanın hüccəti başa düşməsi şərtdir. Əlxüsus uzaq kəndlərdə, alim olmayan ölkədə yaşayan insanların hüccəti başa düşmələri şərtdir. Ona görə Şeyx *(Allah ona rəhmət etsin)* orada bu sözləri *"...o insana üzr yeri qalmasa..."* - qeyd edir. İnşallah qarşıda Hüccəti başa düşmək haqda danışacayıq.

[17] əl-Ənam: 25.

[18] əl-Ənfal: 22

[19] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 69-70

[20] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 11, 317

PDF...

Mənim zənnə qapanaraq kiməsə kafir deməyim, məni dost tutmadığına və yaxud hüccət çatmayan kimsəyə kafir deməyim haqda deyilənlər düşmənlərimizin bizə atdıqları böhtanlardır. Bu söz-söhbətləri yayanlar bununla insanları Allahın və rəsulunun dinindən yayındırmaq istəyirlər"[21].

(Məhəmməd ibn Eydə göndərdiyi digər bir məktubunda isə deyir):

8. "Mən Peyğəmbərə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* olan sədaqətimi izhar etdikdə onlar məni o ki var söydülər, İslam əhlini kafir saydığımı, mallarını halal gördüyümü iddia etdilər. Həmçinin deyirlər ki, Ərəbistan Yarmadasında bir nəfər də olsun kafir yoxdur, ətraf kəndlər dinin əsaslarına zidd olan əməllər edirlər, lakin bu insanlar Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* doğru əqidəsini dərk etdikləri halda onların kafir olduqlarını inkar edirlər. Siz də bilirsiniz ki, kim Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* buyurduqlarını bildikdən sonra inkar edərsə artıq kafir olar. Siz özünüz demişdiniz ki, əgər Muveyyis, İbn İsmail, əl-Udeyli, İbn Abbad və onların ardınca gedənlər bu əqidəyə sahibdirlərsə onlar da kafir, mürtəddirlər"[22].

(Şeyx onların kafir, mürtəd olduqlarını demişdir. Çünki onlar artıq dərk edirdilər ki, şeyxin dəvət etdiyi tövhid Allah və rəsulunun dinidir. Onlar bunu iyirmi ildir ki, təsdiq edirlər. Lakin bununla belə tövhid əqidəsinə və bu əqidə sahiblərinə qarşı düşmənçilik göstərir, şirkin şirk olduğunu bildikləri halda ona dəstək olurlar).

(Ona görə də şeyx *(Allah ona rəhmət etsin)* əvvəldə qeyd edilən sözündən sonra belə deyir):

9. "İkincisi: Onlar iyirmi ildən çoxdur ki, gecə-gündüz, aşkarda və gizlidə bu insanın *(burada şeyx özünü nəzərdə tutur)* dəvət etdiyi tövhidin Allah və rəsulunun dini olduğunu təsdiqləyirlər, amma insanlar yenə də bizə tabe olmurlar. Deyirlər ki, bu insan şirki inkar edir və bu inkarında da haqlıdır. Lakin əgər o *(bu əqidənin haqq olduğunu dərk etdikdən sonra inkar edənlərə)* kafir deməkdən və döyüşməkdən yan keçsəydi doğru iş tutardı. Bax onların camaat qarşısında dedikləri budur. Lakin bununla belə tövhidə və ona meyl edənlərə düşmənçilik edirlər. Sən onların göstərdikləri düşmənçilikdən xəbərdarsan. Kafir deməkdən və döyüşməkdən yan keçsəydi deyirlər. Lakin özləri müşrikin[23] nə olduğunu bildikləri halda şirk mahiyyətli əməlləri dəstəkləyirlər"[24].

(Şeyx imam Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* Həməd ət-Tuveyciriyə göndərdiyi məktubunda deyir):

10. "İbn Əbdülvahhabın adından *"Mənim itaətim altına daxil olmayanlar kafirdir"* deməklə avam insanlara qarşı işlətdiyi kələk, bir böhtandır. Pak və nöqsansız olan Allah bilir ki, bu ağ yalandır. Qəlbizimdə olanları bilən Allaha şahidlik verirəm ki, kim tövhidə əməl edib, şirkdən və şirk edənlərdən uzaq olarsa, harada olmasından və hansı vaxtda yaşamasından asılı olmayaraq o müsəlmandır. Biz, şirkin batil olması haqqında hüccət çatdırdıqdan sonra yenə də uluhiyyətdə *(ibadətdə)* Allaha şərik qoşanları kafir sayırıq. Həmçinin insanları şirkə təşviq edənləri, yaxud onun icazəli olmasını isbatlamaq üçün batil şübhələr gətirənləri, öz silahı ilə Allaha şərik qoşulan məbədlərin müdafiəsinə qalxanları,

---

[21] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nədiyyə: 10, 112-113

[22] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nədiyyə: 10, 114

[23] Kitabın original variantında "Müşrik" sözü deyilir. Amma mənə elə gəlir ki, məzmuna görə burada "Şirk" sözünün işlədilməsi daha doğru olardı.

[24] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nədiyyə: 10, 115

şirki inkar edənlərə qarşı döyüşənləri və tövhidi boğmağa çalışanları kafir sayırıq. Sığınacağımız yalnız Allahadır. Vəssalam!"[25].

**(Şeyxülislam Məhəmməd ibn Əbdülvahhab yalnız, Allah və rəsulunun dininə düşmənçilik edənləri, insaları bu dindən yayındıranları, eləcə də bütlərə ibadət etməyin müşriklərin dinindən olduğunu bildikdən sonra yenə də bu bütlərə ibadəti davam etdirənləri və başqalarını bu ibadətə təşviq edənləri kafir saydığını qeyd edərək deyir):**

11. "Mənim ümumi şəkildə camaata kafir deməyim haqqında deyilənlər düşmənlərin bir böhtanıdır. Həmçinin onların mənim adımdan, kim Allah və rəsulunun dininə tabe olub öz ölkəsində yaşayır lakin mənim yanıma gəlmirsə onun dini məqbul deyildir, deməsi bir böhtandır. Əsas məqsəd harada olmasından asılı olmayaraq Allahın və rəsulunun dininə itaət etməkdir. Biz, Allah və rəsulunun dinini təsdiq etdikdən sonra ona qarşı ədavət göstərən və insanları ondan yayındıranları, bütlərə ibadət etməyin müşriklərin dinindən olduğunu bildikdən sonra yenə də bu bütlərə ibadəti davam etdirənləri və başqalarını bu ibadətə təşviq edənləri kafir sayıram. Yalnız inadkar və cahillər istisna olmaq şərti ilə, yer üzündə olan hər bir elmli insan belələrini kafir sayır. Allah daha yaxşı biləndir vəssalam!"[26].

**Şeyx Abdullah ibn şeyx Məhəmməd ibn Əbdülvahhab** *(Allah ona rəhmət etsin)* **deyir:**

12. "Haqqı gizlətmək və insanları bizdən yayındırmaq üçün bizim adımızdan yalan uydururlar ki, *(bu yerdə bir neçə məqamı sadlayır və sonra deyir:)* guya biz, zəmanəmizin insanlarını və altıncı yüzillikdən sonra yaşayıb bizim fikrimizdə olmayanları ümumi mənada kafir sayırıq!"[27].

**(Daha sonra şeyx öz dediklərinə aydınlıq gətirərək deyir):**

Biz vəfat edənlər haqqında deyirik ki, onlar keçib gedən bir ümmət idilər. Biz yalnız haqq dəvətimiz yetişib, həqiqət aydın olandan və hüccət çatandan sonra təkəbbürlülük göstərib, inadkarlıq edən insanları kafir sayırıq. Bizim bu gün döyüşdüyümüz insanları buna məsəl çəkmək olar. Onlar Allaha şərik qoşmağa davam edir, vacib əməlləri yerinə yetirməkdən imtina edir, açıq-aşkar böyük günahlar və haram işlər görürlər...".

**(Daha sonra sözünə davam edərək deyir):**

"Əgər bizə belə bir sual ünvanlanarsa ki, sənin səhv edib və sonra səhvi özünə deyiləndə onu düzəldənə qarşı olan mövqeyin belədirsə, bəs şəriət dəlillərindən baş çıxaran, müdrik alimlərin sözlərini oxuyub ölənə qədər öz səhvi üzərində qalan insana qarşı mövqeyin necədir?

Biz bu sualın cavabında deyərik: Qeyd edilən insanlar üçün üzrxahlıq etmək olar. Biz onlara kafir demirik. Ona görə yox ki, onlar səhv ediblər və bu səhvlər üzərində israrlı olublar. Onların vaxtında bu məsələni dili və silahı ilə müdafiə edən qarşı tərəf olmadığından, onlara hüccət çatmadığından, həqiqət aydın olmadığından biz onlara kafir demirik... Bax bizim əqidəmiz budur. Biz zorakılıq və təəssübçülükdən xali olan ağıl, elm və insaf sahiblərinə xitab edirik. Sözü deyən adama yox, dediyi sözə baxmaq lazımdır"[28].

**Şeyx Süleyman ibn Suhman** *(Allah ona rəhmət etsin)*, **Məhəmməd ibn Əbdülvahhabın** *(Allah ona rəhmət etsin)* **belə dediyini nəql edir:**

---

[25] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 128
[26] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 131
[27] O, bu sözləri inkar mənasında deyir.
[28] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 229-236

PDF...

13. "Qəlbizimdə olanları bilən Allaha şahidlik verirəm ki, kim tövhidə əməl edib, şirkdən və şirk edənlərdən uzaq olarsa, harada olmasından və hansı vaxtda yaşamasından asılı olmayaraq o müsəlmandır. Biz, şirkin batil olması haqqında hüccət çatdırdıqdan sonra yenə də Allaha şərik qoşanları kafir sayırıq. Həmçinin insanları şirkə təşviq edənləri, yaxud onun icazəli olmasını isbat etmək üçün batil şübhələr gətirənləri, öz silahı ilə Allaha şərik qoşulan məbədlərin müdafiəsinə qalxanları, şirki inkar edənlərə qarşı döyüşənləri və tövhidi boğmağa çalışanları kafir sayırıq. Sığınacağımız yalnız Allahadır"[29].

**(Şeyx Məhəmməd ibn Əbdülvahhab** *(Allah ona rəhmət etsin)* **əs-Suveydi əl-Bağdadiyə göndərdiyi məktubunda deyir):**

14. "Sən deyirsən ki, mən, yalnız mənim ardımca gedənlər istisna olmaqla, cəmi insanları kafir sayır, onların nikahlarının batil olduğunu iddia edirəm! Əcəba, bu fikir ağıllı insanın ağlına necə gələr? Bunu müsəlman deyər yoxsa kafir? Bilən deyər yoxsa bilməyən? ... Kiməsə kafir demək məsələsinə gəldikdə, mən yalnız, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* dinini dərk edib bundan sonra onu söyəni, insanları ondan yayındıranı və bu dinə riayət edənləri düşmən görən kimsələri kafir sayıram. Allaha şükür olsun ki, ümmətin çox hissəsi bu cür *(küfr)* əməl sahibi deyildir"[30].

**(Şeyx Məhəmməd ibn Əbdülvahhab** *(Allah ona rəhmət etsin)* **deyir):**

"Biz, şirkin batil olması haqda hüccət çatdırdıqdan sonra uluhiyyətdə *(ibadətdə)* Allaha şərik qoşan insana kafir deyirik"[31].

**(İmam Əbdüləziz ibn Məhəmməd ibn Səud** *(Allah onlara rəhmət etsin)* **rumlulara və digər əcnəbi ölkələrdə yaşayan insanlara xitab edərək deyir):**

15. "Biz bilirik ki, bizim düşmənlərimiz sizin yanınıza gəlir və haqqımızda yalan danışıb deyirlər ki, onlar Peyğəmbəri *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* söyür, bütün insanları kafir sayır, altıncı yüzillikdən sonra yaşayanlara kafir deyir və özlərinin ölkəsinə hicrət etməyənlərə kafir kimi baxırlar və s. bu kimi bir çox iftiralar atırlar. Lakin aqil insan bütün bunların bir böhtan, zülm və ədavət olduğunu bilir. Lakin bizim örnəyimiz Peyğəmbərdir *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)*. Onun düşmənləri də deyirdilər ki, o, İsanı və onun anasını söyür. Onun özünə isə alçaq, sehrbaz və dəli deyirdilər. Biz yalnız, tövhidi dərk edəndən sonra onu söyənləri, bunu xəvariclərin dini adlandıranları, şirkin mahiyyətini bildikdən sonra onu sevənləri, şirk edənlərə qarşı məhəbbət bəsləyənləri, ona dəvət edənləri və insanları bu əmələ təşviq edənləri, hüccət çatdırdıqdan sonra, şirk etməsələr də, *(bu əməlinə görə)* onları kafir sayırıq. Yaxud şirk edib adını saleh insanlarla təvəssül adlandıran kimsə də, Allahın belə təvəssülü haram etməsini biləndən və ya Allahın nazil etdiyinin bəzisinə nifrət edəndən sonra deyilən hökmdədir. Belə ki, Allah təala buyurur: "**Bu ona görədir ki,** ***(kafirlər)*** **Allahın nazil etdiyini** ***(Quranı)*** **bəyənmədilər,** ***(Allah da)*** **onların əməllərini puç etdi**"[32]. Yaxud din və Qurana istehza edərsə *(lağa qoyarsa)* deyilən hökmə aid olar. Bu haqda Allah təala buyurur: "***(Ya Rəsulum!)*** **Onlardan** ***(Təbuk döyüşünə gedərkən səni lağa qoyan münafiqlərdən nə üçün belə etdiklərini)*** **soruşsan: "Biz ancaq söhbət edib zarafatlaşırdıq** ***(əylənirdik)"*****,- deyə cavab verərlər. De: "Allaha, Onun ayələrinə və Peyğəmbərinə**

[29] Baxın, *"Tənbih Zəvil Əlbab əs-Səlimə Anil Vuqui Fil Əlfaz əl-Mubtədiətil Vaximə"* və *"Təbriət əş-Şeyxeyn əl-İmameyn Min Təzviri Əhlil Kəzibi və Meyni"*səh, 121.

[30] Ötən mənbə: səh, 121.

[31] Məcmu Muəlləfət əş-Şeyx: 12, 60.

[32] Məhəmməd: 9

**istehzamı edirsiniz?!** ***(Əbəs yerə)*** **üzr istəməyin. Siz iman gətirdikdən sonra** ***(daxilinizdəki ikiüzlülüyü biruzə verməklə, Allahın əmrlərini unutmaqla)*** **artıq kafir oldunuz. Aranızda bir qismini** ***(tövbə edəcəyinə görə)*** **bağışlasaq da, digər qismini günahkar olduğu üçün əzaba düçar edəcəyik!**"[33] Alimlər bu ayə haqqında deyirlər ki, Allaha istehza *(lağ)* etmək yekdilliklə qəbul edilmiş müstəqil bir küfrdür. Peyğəmbərə istehza *(lağ)* etmək yekdilliklə qəbul edilmiş müstəqil bir küfrdür. Bizim dindən çıxaran küfr saydığımız və belə əməlləri edənlərin kafir olduqlarını deməyimiz, bütün məzhəb alimləri tərəfindən dindən çıxaran küfr olaraq yekdilliklə təsdiqlənmişdir. Allaha şükür olsun ki, dörd məzhəb alimlərinin və digərlərinin kitabları mövcuddur. Və sonda Peyğəmbərimiz Məhəmmədə və əshabına Allahın salamı olsun!"[34]

Şeyx Əbdüllətif ibn Əbdürrəhman ibn Həsən *(Allah ona rəhmət etsin)* Şeyxülislam Məhəmməd ibn Əbdülvahhabın *(Allah ona rəhmət etsin)* əqidəsi və dəvətinin mahiyyəti haqqında soruşuldu?

(Demək şeyx, Məhəmməd ibn Əbdülvahhabın *(Allah ona rəhmət etsin)* əqidəsini qeyd edərkən kiməsə kafir demədən öncə ona hüccət çatdırmağın zəruriliyinin Məhəmməd ibn Əbdülvahhabın əqidəsi olduğunu çatdırmaq üçün Şeyxülislam İbn Teymiyyənin *(Allah ona rəhmət etsin)* sözünü bir sübut olaraq nəql edir).

16. Şeyxülislam İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* deyir: "İslam dininin dəyişməz qaydalarına əsasən deyə bilərik ki, Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* öz ümmətinə istər ölmüş peyğəmbərlərdən, istərsə də dünyasını dəyişmiş adi insanlardan istiğasə və ya başqa adla dua edib kömək diləməyi buyurmamışdır. Həmçinin ölüyə və ya ölü üçün səcdə etməyi və s. bu kimi əməlləri buyurmamışdır. Əksinə bizim bildiyimiz qədər Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* bütün bu kimi əməlləri qadağan etmişdir. Bütün bunlar Allah və rəsulunun haram buyurduğu şirk əməllərdir. Lakin son zamanlar bir çox insanlarda şəriət haqqında cəhalətin çoxalması, elmin azalması onlara bu əməllərə görə kafir deməyə imkan vermir. Onlara kafir demək üçün Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* şəriətini və ona müxalif olan fikirləri bəyan etmək lazımdır"[35].

(Digər bir məqamda isə Əbdüləziz əl-Xatibə məktub yazıb, bir neçə məsələ haqqında ona etirazını bildirir və orada belə bir məqama toxunur):

17. "Hicrətin 67-ci ilində əl-Əhsa vilayətində sizə oxşar iki nəfər xəvaric görmüşdüm. Onlar cümə və camaat namazlarını tərk etmiş, öz yaşadıqları yerdə müsəlmanlara kafir deyirdilər. Onlar da sizin dediyiniz dəlillərə əsaslanır və deyirdilər: əl-Əhsa camaatı Məhəmməd ibn Əbdülvahhabın dəvətini rədd edən, tağutu inkar etməyən babasının, kafir olduğunu deməyən İbn Firuzun ailəsi ilə oturub-durur və onlarla ünsiyyət qururlar. Həmin iki nəfər şəxs deyirdilər ki, kim bu insanın kafir olduğunu açıq-aşkar deməsə o Allaha küfr etmişdir. Belə halda o tağutu inkar etmiş sayılmır. Kim belə insanlarla oturub durarsa o da onlar kimidir. Onlar, yalan və iftara əsasında qurulmuş bu iki iddianı, həqiqi mürtədlərə[36] aid olan qaydalarla əlaqələndirib bir çox hökmləri tərk etmişlər. Hətta onlar özlərinə *(kafir saydıqları camaat tərəfindən)* verilən salama cavab da qaytarmırdılar. Onlar haqqında mənə şikayət gəldi və mən onları gətirtdirdim. Onları hədələyib, sərt davrandım. İlk olaraq mənə,

[33] ət-Tövəb: 65-66
[34] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 263-264
[35] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 414. əs-Sual vəl İcabə: səh, 372
[36] Mürtəd sözünün mənası, müsəlman olduqdan sonra həqiqi mənada dindən çıxmaq deməkdir.

özlərinin şeyx Məhəmməd ibn Əbdülvahhabın əqidəsində olduqlarını və onun məktublarını oxuduqlarını dedilər. Mən onların şübhələrini aşkara çıxartdım və bildiklərimə əsaslanıb onların zəlalətdə olduqlarını bəyan etdim. Sonra onlara şeyx Məhəmməd ibn Əbdülvahhabın bu əqidədən və məzhəbdən uzaq olduğunu onlara çatdırıb dedim: Şeyx, yalnız alimlərin yekdilliklə *(hansısa əməlin insanı islamdan çıxaran küfr olması haqqında)* razılaşdıqları, məsələn, **hüccət çatdıqdan və bu dəlillər tam dərk olunduqdan** sonra böyük şirk etmək, Allahın ayələrinə, peyğəmbərlərinə və s. küfr etmək kimi əməllərə görə kiməsə kafir deyir. Salehlərə ibadət edənlər, dua edib onlardan kömək diləyənlər, bu adamları Allahın haqqı sayılan ibadətlərdə və ilahilikdə Ona ortaq tutanlar, elm və iman əhli tərəfindən *(deyilən şərtlərə əsasən)* yekdilliklə kafir sayılır"[37].

(Həməd ibn Nasir Ali Muammar və Şeyx Məhəmməd ibn Əbdülvahhabın övladlarının açıq-aşkar şəkildə müəyyən insana hüccət çatdırmağın şərt olması haqda söylədikləri fətva):

18. "Onlara belə bir sual verilir: Biz eşitmişik ki, siz əvvəllər yaşayan İbn əl-Farid və digər belə məşhur əhli sünnə alimlərini kafir sayırsınız?
Cavabında deyirlər: Bizim, adını sadaladığınız alimlərə və digər insanlara kafir deməyimiz haqqında qeyd etdikləriniz, insanları doğru yoldan uzaqlaşdırmaq üçün düşmənlərimizin bizim haqqımızda dedikləri böhtanlardandır. Onlar bizim haqqımızda bir çox başqa böhtanlar da yaymışlar. Bizim isə cavabımız belədir: "**…Aman *(Allah)*! Bu, çox böyük bir böhtandır!...**" [38] Biz yalnız hüccət çatdıqdan sonra haqqı bilib, dəvət olunduqdan sonra yenə də onu inkar edən, inadkarlıq göstərib üz çevirən insana kafir deyirik. Bundan başqa kiməsə kafir dediyimizi iddia edən insan bizim adımızdan yalan danışır... (Belə açıq-aydın sözlərdən sonra İbn əl-Farizin əhli sünnədən deyil, küfr əməllərin sahibi və ilhadçı olduğunu bəyan edirlər).

(Daha sonra isə deyirlər):

19. "Siz diqqət edin ki, burada şeyx bu sözün küfr olduğunu qeyd edir. Amma bu sözü deyənin isə kafir olduğunu demir. Bu fərqi başa düşün. Çünki hüccət çatmamış müəyyən bir insana kafir demək olmaz. Zənnimcə, şeyx bu sözləri deyərkən haqqında danışılan adama hüccət çatmadığını düşünmüşdür. Çünki İbn əl-Fariz və onun kimilər cahillikləri ucbatından öz məzhəblərində və sözlərində olan küfr söz və əməllərdən bixəbərdirlər..."[39].

(Məhəmməd ibn Əbdülvahhabın övladları, Şeyx Hüseyn və Şeyx Abdullah *(Allah onlara rəhmət etsin)* cavablarının birində deyirlər):

20. "On səkkizinci məsələ: Tövhid dəvəti yetişən ölkə əhalisinin bir hissəsi deyir ki, bu dəvət haqdır, lakin mən heç bir pis işi dəyişən, yaxud yaxşı işləri əmr edən deyiləm. *(Bu əqidəyə görə)* düşmən və ya dost tutan deyiləm, bu dəvət çatmadan öncə yaşayanların zəlalət üzərində olduğunu da deyən deyiləm. Bununla bərabər *"Biz dədə-baba dinindən əl çəkdik"* deyən müvahhidlərə irad tuturlar. Bəziləri müsəlmanları açıq-aşkar şəkildə kafir sayır, bu dini söyərək deyir: Bu, Museyləmənin[40] dinidir. Həmçinin bəziləri bu dəvətin açıq şəkildə deyil, gizşli şəkildə gözəl olduğunu deyirlər. İndi siz bu vəziyyətdə olan bir ölkə haqqında

[37] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 467-468
[38] ən-Nur: 16
[39] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 3, 20-23
[40] Museyləmə, Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) vəfatından sonra özünü açıq-aşkar peyğəmbər elan etmişdir.

nə deyə bilərsiniz? Onlar müsəlmandırlar yoxsa kafir? Şeyxin[41] və digər alimlərin bu *"biz ümumi şəkildə kafir demirik"* sözünün mənası nədir? Ümumi ilə xüsusi arasında nə fərq vardır? və s. i.a."

Cavab: Deyilən ölkə əhalisinə hüccət çatmışdırsa onlar kafirlərin hökmündədirlər. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olar. Həmin ölkədə yaşayıb, dininə riayət edə bilməyən müsəlman, Allahın üzürlü saydığı kimsələr istisna olmaqla, oradan hicrət etməlidir. Əgər o hicrət etməzsə o da qətlə yetirilməkdə və malının müsadirə olunmasında həmin ölkə əhalisinin hökmündədir. Şeyxin, *"biz ümumi şəkildə kafir demirik"* sözünə gəldikdə isə deyə bilərik ki, ümumi və xüsusi sözləri arasında olan fərq açıq-aşkar görsənir. Ümumi mənada kafir demək odur ki, alim və cahil olan, hüccət çatan və çatmayan bütün insanlar kafir sayılsın. Xüsusi mənada kafir demək isə yalnız şəriət dəlilləri ilə hüccət çatmış insanlara aiddir. Elə bir hüccət ki, ona müxalif olan kafir olar. Ola bilər ki, deyilən ölkə əhalisinin kafir olmaları haqda hökm verilsin və onlar kafir hökmündə olsunlar. Amma həmin ölkədə yaşayan hər bir fərdin kafir olmasını isə demək doğru deyildir. Çünki, ola bilər ki, onların arasında müsəlman kimsələr olsun. Hicrət edə və ya öz dinlərini izhar edə bilmədikləri üçün üzrlü sayılsınlar. Necə ki, Allah təala əhalisi kafir olan zamanlar Məkkə haqqında buyurmuşdu: "**Əgər *(Məkkədə)* tanımadığınız mömin kişi və qadınları bilmədən ayaq altına alıb əzmək və bundan dolayı sizə günah gəlmək ehtimalı olmasaydı *(Allah siz möminlərin hamılıqla Məkkəyə daxil olmasına izin verərdi)*...**"[42]. Digər bir ayədə isə buyurur: "***(Ey müsəlmanlar!)* Sizə nə olub ki, Allah yolunda *(hicrət etməyib, yaxud əsir kimi Məkkədə qalıb)*: "Ey Rəbbimiz, bizi əhalisi zalım olan bu şəhərdən *(Məkkədən)* kənara çıxart, bizə öz tərəfindən mühafizəçi göndər, yardımçı yolla!" – deyə dua edən aciz kişilər, qadınlar və uşaqlar uğrunda vuruşmursunuz?**"[43]. Səhih hədisdə İbn Abbas *(Allah ondan razı olsun)* deyir: ***"Mən və anam Məkkədə qalan acızlərdən idik"***[44].

(Şeyxülislam Məhəmməd ibn Əbdülvahhabın oğlu Abdullahın, hüccət çatdıqdan sonra Allaha şərik qoşanların kafir olması haqqında atasından nəql etdiyi söz və ona əlavə etdiyi açıqlama):

21. "Siz şeyxin, sitatın sonunda deyilən sözünə diqqət edin. Heç şübhə yoxdur ki, bu insanların dedikləri söz tövbə olunmadığı təqdirdə Allahın bağışlamadığı böyük şirkdir, küfrdür. Bu, insanı dindən çıxardan və aləmlərin Rəbbinə küfr etməklə nəticələnən, bir əməldir. Baxın görün, şeyx yalnız belə əməl sahibinə Quran və sünnə dəlilləri ilə hüccət çatdıqdan sonra yenə də öz əməlində israrlı olanların küfr etdiklərini və dindən çıxdıqlarını açıq-aşkar şəkildə qeyd etmişdir. Allahın Peyğəmbərinə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* göndərdiyi İslam dinini bilən insan bu məsələdə fikir ayrılığında olmaz. Allah daha yaxşı biləndir"[45].

(Şeyxülislam Məhəmməd ibn Əbdülvahhabın oğlu Abdullahın, cahil insana şəriət dəlilləri ilə hüccət çatmadan öncə ona kafir deməməsi haqqında söylədiyi fətva. O bu fikrini *"öləndən sonra yandırılıb külünün sovrulmasını tələb edən"* kişinin hədisi ilə əsaslandırmışdır. O deyir):

---

[41] Yəni, Məhəmməd ibn Əbdülvahhabın *(Allah ona rəhmət etsin)*.

[42] əl-Fəth: 25

[43] ən-Nisa: 75

[44] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 144-145

[45] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 236

PDF...

22. "Abdullah ibn Şeyx *(Allah onlara rəhmət etsin)* belə bir sual ilə soruşulur: Cahilliyi ucbatından bilmədən küfr sayılan söz, əməl və ya təvəssül edən insan üzürlü sayılırmı?

Cavab: Allaha və rəsuluna iman gətirən insan Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* şəriəti barəsində cahilliyi üzündən əməldə və ya etiqadda küfr edərsə bu insan bizə görə kafir sayılmır. Biz belə bir insana şəriət dəlilləri ilə hüccət çatana qədər kafir demirik. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olar. Əgər ona hüccət çatdırılarsa və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* buyurduqları bəyan edilərsə və hüccət çatdıqdan sonra yenə də öz dediklərində israrlı olarsa o zaman kafir olar. Çünki küfr, bəzi hallarda Allahın kitabına və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* sünnəsinə müxalif çıxmaqla olur. Bu, bütün alimlər tərəfindən ümumi anlamda qəbul edilmiş bir qaydadır. Alimlər buna dəlil olaraq bu ayəni qeyd edirlər. Belə ki, Allah təala buyurur: "**…Biz, peyğəmbər göndərməmiş *(heç bir ümmətə)* əzab verməriк!**"[46] Digər bir ayədə isə deyilir: "**Kafirlər dəstə-dəstə Cəhənnəmə sürüklənəcəklər. Nəhayət, ora çatınca onun qapıları açılacaq və cəhənnəm gözətçiləri onlara deyəcəklər: "Məgər sizə öz içərinizdən Rəbbinizin ayələrini oxuyan, sizi bu gününüzə qovuşacağınızla qorxudan peyğəmbərlər gəlməmişdi?" Onlar isə: "Bəli *(gəlmişdi)*, lakin əzab sözü *(əzab hökmü biz)* kafirlər barəsində vacib oldu!" – deyə cavab verəcəklər**"[47].

Həmçinin onlar iki səhih, sünən və digər İslam ədəbiyyatlarında Huzeyfənin *(Allah ondan razı olsun)* rəvayət etdiyi hədisi dəlil gətirirlər. Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* buyurur: "Sizdən öncə yaşayan ***bir nəfər öz övladlarına demişdi: "Mən öləndə məni yandırıb külümün yarısını dənizə yarısını isə quruya səpələyərsiniz. Allaha and olsun, əgər Allah məni yenidən diriltsə heç kimi cəzalandırmadığı bir əzabla məni cəzalandıracaqdır. Allah dənizə və quruya əmr etdi ki, ona atılmış külü toplasınlar. Onlar da bunu yerinə yetirdilər. Sonra Allah təala ol deməklə həmin kişi dərhal oldu. Sonra Allah təala ona dedi: Bunu etməyə səni nə vadar etdi? Kişi dedi: Sənin qorxun. Çox keçmədən Allah təala onu bağışladı".*** Bu adamın etiqadına əsasən deyilən prosesdən sonra Allah onu bir daha dirildə bilməyəcəkdir. O bunu küfr və ya inkar baxımından deyil, cahilliyindən demişdir. O, Allahın onu yenidən diriləcəyinə şübhə ilə yanaşmışdır. Lakin bununla belə Allah təala yenə də onu bağışladı, rəhm etdi. Quran yetişən hər bir insana artıq Peyğəmbərlə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hüccət çatmışdır. Lakin cahil insana bunu çatdırmaq üçün onu öyrədən elm adamı lazımdır. Allah daha yaxşı bilir"[48].

(Həmçinin üçüncü başlıqda): "Tövhid əqidəsinə, İslamın beş əsasına və imanın altı şərtinə əməl edib dünyasını dəyişən insan haqqında soruşulmuşdur. Belə ki, *(ölmüş adamlardan)* kömək istəyən, onlara dua və təvəssül edən, əvvəldə deyilən iki hədisə[49] əsaslanaraq cahilliyi və ya axmaqlığı ucbatından Peyğəmbəri *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* öz duasında vasitəçi qoşub dua edən insanın hökmü nədir?

Cavab:

23. "Biz ölmüş insandan kömək istəyənlər haqqında danışmışdıq. Bu əməllə, duada təvəssül etmək arasında olan fərqi də qeyd etmişdik. Demişdik ki, ölmüş insandan dua edib

---

[46] əl-İsra: 15
[47] əz-Zümər: 71
[48] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 239-240
[49] Bu hədislərin biri, kor kişinin hədisidir. Digəri isə Ərş haqqında olan hədisdir.

kömək istəmək, ehtiyacların ödənilməsini tələb etmək, qəm-kədərin aparılmasını diləmək Allah və rəsulunun haram buyurduğu böyük şirkdən sayılır. Bütün ilahi kitablar və Peyğəmbərlərin dəvəti bu kimi əməllərin haramlığını, belə əməl sahiblərinin kafir olmasını, onlardan uzaq olmağı və bu əməllərinə görə onlara qarşı çıxmağı birmənalı olaraq qəbul edir.

Lakin, fətərat vaxtı *(dini anlayışların zəiflədiyi vaxtlarda)* və cahilliyin çoxaldığı bir zamanda fərdi insan hüccət çatana qədər bununla kafir olmur. Belə ki, bu kimi insanalara şəriət dəlilləri açıqlanmalı, bu əməlin Allah və rəsulunun haram buyurduğu böyük şirkdən olduğu bildirilməlidir. Əgər ona hüccət çatarsa, Quran ayələri və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hədisləri ona çatdırılarsa, bundan sonra yenə də öz şirkində davam edərsə kafir olar. Amma cahillik üzündən, özünə bu haqda bir məlumat verilməyən insanın bu əməli küfrdür, lakin onun özünə isə hüccət çatdırılmadan önvə kafir hökmü verilmir. Ona hüccət çatandan sonra etdiyi şirk əməlində israrlı olarsa, Lə İləhə illəllah Muhəmmədən rəsuləllah kəlməsinə şəhadət verib, namaz qılıb, zəkat çıxarıb, imanın altı əsasına iman gətirsə də artıq kafir olar"[50].

(Şeyx Süleyman ibn Suhman *(Allah ona rəhmət etsin)* ona ünvanlanan bir neçə suala belə cavab vermişdir):

24. Zahiri baxımdan nə müsəlman nə də kafir olan cahil bir kimsə, digəri isə zahiri baxımdan kafir olan, başqası isə zahiri baxımdan küfrə çatmayan böyük günahlar işlədən insan haqqında nə deyə bilərsiniz?

Cavab: Zahiri baxımdan nə müsəlmana nə də kafirə bənzəməyən cahil insan haqqında hökm belədir. Əgər həmin cahil insan, adamı islama daxil edən əsasa[51] sahibdirsə, hətta dinini təfsilatı ilə bilməsə də o artıq müsəlmandır. Allah və rəsulunun buyurduğu şəriəti təfsilatı ilə öyrənməyə imkanı olmayan sıravi müsəlmanın, Allahın elm bəxş etdiyi alimlərin və seçilmiş insanların bildikləri təfsilati məsələləri, dini hökmləri bilməsi vacib deyildir. Sıravi müsəlmanların boynuna düşən, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* buyurduqlarına ümumi şəkildə iman gətirməkdir. Bu qaydanı şeyxülislam İbn Teymiyyə Minhacus Sünnə adlı kitabında təsdiq etmişdir. Yox əgər həmin insan, adamı islama daxil edən əsasa sahib deyilsə o kafirdir. Onun küfrü, dinini öyrənməkdən üz çevirdiyinə, dinini tanımadığına, öyrənmədiyinə və ona əməl etmədiyinə görədir.

Mənə görə kiminsə zahiri baxımdan nə müsəlman nə də kafir olmadığını demək bir məna kəsb etmir. Çünki insan ya zahirən cahil müsəlman, ya da cahil kafir olmalıdır. Zahiri görünüşü küfr olan, kafirdir. Zahiri görünüşü asilik olan insan da asidir. Biz yalnız, hüccət çatdıqdan sonra Allah və rəsulunun kafir saydığı insanı kafir sayırıq"[52].

25. (Şeyx Süleyman ibn Suhman *(Allah ona rəhmət etsin)* Məhəmməd ibn Əbdülvahhabın *(Allah ona rəhmət etsin)* belə dediyini nəql edir): "Əhməd əl-Bədəvinin qəbri üzərində ucaldılan bütə səcdə edənlərə cahillikləri və onları xəbərdar edənlərin olmamasından dolayı onlara kafir demiriksə, necə ola bilər ki, Allaha şərik qoşmayan insanı bizim yanımıza hicrət etmədiyinə görə kafir sayaq!"[53].

(Dgər bir məqamda yenə Şeyx Süleyman ibn Suhman *(Allah ona rəhmət etsin)* deyir):

---

[50] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 273-274

[51] Yəni, kəlmeyi şəhadəti deyibsə.

[52] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 469-470

[53] Minhacu Əhlil Haqq vəl İttiba. İbn Suhman, səh, 56.

PDF...

26. "Deyilənlərdən görsənir ki, Şeyxin[54] *(Allah ona rəhmət etsin)* Nəcd və ətraf kəndlərin əhalisinə qarşı döyüşməsinə səbəb bu idi. Belə ki, bu insanlara Allah və rəsuluna iman gətirməyin, Ondan başqasına ibadət olunanlara küfr etməyin vacibliyi haqqında şəriət dəlilləri ilə hüccət çatdıqdan sonra yenə də onlar öz küfrlərində israr edir, Allahın nurunu söndürmək üçün çalışır, onu inkar edir, öldükdən sonra yenidən diriləcəklərinə iman gətirmirdilər. Demək *(şeyxin bu)* mübahisəsi dinin ən önəmli əsası sayılan bir sahəsi barəsindədir. Allah bizə yetərlidir, O nə gözəl hamidir"[55].

(Şeyx Süleyman ibn Suhman *(Allah ona rəhmət etsin)* Məhəmməd ibn Əbdülvahhabın *(Allah ona rəhmət etsin)* Şərifə yazdığı məktubunda belə dediyini nəql edir):

**27.** "Bizə qarşı atılan yalan və böhtanlara gəldikdə isə onlar deyirlər ki, guya biz ümumi şəkildə camaata kafir deyir, *(digər ölkələrdə)* yaşayıb dinini rahat şəkildə yaşayanların bizim torpaqlara hicrət *(köç)* etməsini vacib sayır, kiməsə kafir deməyəni kafir sayır, döyüşlərdə iştirak etməyənləri kafir sayırıq və s. bu kimi məlumatlar yalandır, böhtandır. Bu söz-söhbətləri yayanlar bununla insanları Allahın və rəsulunun dinindən yayındırmaq istəyirlər. Biz, cahilliyi və bixəbər olması ucbatından Əbdülqadirin, Əhməd əl-Bədəvinin və bu kimi qəbirlərin üzərində ucaldılan bütlərə ibadət edənlərə kafir demiriksə, Allaha şərik qoşmayan insanlara necə kafir deyərik?! Yaxud bizim torpaqlara hicrət *(köç)* etməyib, kiməsə kafir deməyənlərə və döyüşlərdə iştirak etməyənlərə necə kafir deyərik?! "**…Aman *(Allah)*! Bu, çox böyük bir böhtandır!...**"[56]**.**

(Şeyx ibn Suhman *(Allah ona rəhmət etsin)* bu sözə əlavə olaraq deyir):

28. "Əgər şeyx cahilliyi və bixəbər olması ucbatından qəbirlərin üzərində inşa edilən bütlərə ibadət edənlərə qarşı belə münasibət bəsləyirsə, necə ola bilər ki, yer üzündə yaşayanların hamısını kafir saysın, onlara qarşı müharibə elan etsin, mallarını halal görsün?! Şeyxin hal-vəziyyətini və nəyə dəvət etdiyini dərk edən aqil insan belə bir halı təsəvvür edə bilərmi?! Heç bir halda şeyx, ümmətdən, hətta əhli sünnə və camaatdan ayrılıb özündən yeni bir fikir söyləməmişdir. Onun bu məsələ, yəni, ad və sifətlər tövhidi, əməllər və ibadətlər haqqında dedikləri bütün müsəlmanlar tərəfindən birmənalı olaraq təsdiq edilmişdir. Bu işdə yalnız onların yolundan və mənhəcindən çıxan, cəhmiyyələr, mötəzililər, qəbirlərə ifratcasına sitayiş edənlər müxalif olmuşlar. Şeyxin buyurduğu məsələlər bütün peyğəmbərlərin və səmavi kitabların dediyində öz əksini tapmışdır. Bunu, peyğəmbərlərin və səmavi kitabların göndəriliş məqsədini bilənlər dərk edirlər. Şeyx hüccətin layiqli formada çatdırılmasından sonra bu əsaslara görə kiməsə kafir hökmünü verir. O bu işdə siratəl müstəqim yolu ilə özündən əvvəlkilərin ardınca gedir. Heç də dinə bidət *(yenilik)* gətirməmişdir"[57].

(Şeyx Abdullah ibn Məhəmməd ibn Əbdülvahhab deyir):

29. "Sən şeyxin (yəni, Şeyxülislam İbn Teymiyyənin) *"Ey filankəs ağa, mənə kömək et"* və s. bu kimi dualarla peyğəmbəri və ya övliyanı köməyə çağıranlar haqda dediyi sözə fikir ver. O deyir ki, belə insandan tövbə etməsi tələb olunur. Əgər tövbə etsə bağışlanır, əks

---

[54] Yəni, Məhəmməd ibn Əbdülvahhab

[55] Kitabu Tənbih Zəvil Əlbab əs-Səlimə Anil Vuqui Fil-Əlfaz əl-Mubtədiətil Vaximə və Təbriətuş Şeyxeyn əl-İmameyn Min Təzvir Əhlil Kəzib vəl Meyn: Səh, 120.

[56] ən-Nur: 16

[57] Kitabu Tənbih Zəvil Əlbab əs-Səlimə Anil Vuqui Fil-Əlfaz əl-Mubtədiətil Vaximə və Təbriətuş Şeyxeyn əl-İmameyn Min Təzvir Əhlil Kəzib vəl Meyn: Səh, 122-123.

halda isə öldürülür. Şeyx şirk edənlərə tövbə etməyi tələb etdikdən və hüccət çatdırdıqdan sonra *(dəvəti qəbul etməsələr)*, onlara açıq-aydın kafir hökmü verir"[58].

Şeyx Abdullah ibn Məhəmməd ibn Əbdülvahhabdan soruşurlar: Qəbirlərin üzərində qübbələr tikmək onu tikənin kafir olmasına dəlalət edirmi?

Cavab:

30. "Bu məsələnin açıqlamaya ehtiyacı vardır. Əgər onu tikən insana Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* belə tikililərin tikilməsini qadağan etməsi və öz vaxtında olan bu kimi tikililəri sökməsi haqqında məlumat çatıbsa və bundan sonra həmin adam inadkarlıq və asilik etsə, yaxud o qübbəni sökmək istəyənlərin qarşısını alarsa bu küfrün əlamətidir. Amma kim bunu Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* göndərilmə məqsədi haqqında cahil olduğundan edərsə bu onun küfr etməsinə dəlalət etmir. Bu onun cahilliyinə, bidətçi olmasına və Allahın, Öz Peyğəmbərinə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* qəbirlər barəsində buyurduğunu axtarmaqdan yayınmasına dəlalət edir"[59].

(Şeyx Əbdüllətif ibn Əbdürrəhman Ali əş-Şeyx, Şeyx Məhəmməd ibn Əbdülvahhabın təkfir məsələsi haqda əqidəsini bəyan edərək deyir):

31. "O, *(yəni, Şeyx Məhəmməd ibn Əbdülvahhab)* yalnız alimlərin yekdilliklə *(hansısa əməlin insanı islamdan çıxaran küfr olması haqqında)* razılaşdıqları, məsələn, **hüccət çatdıqdan və bu dəlillər tam dərk olunduqdan** sonra böyük şirk etmək, Allahın ayələrinə, peyğəmbərlərinə və s. küfr etmək kimi əməllərə görə kiməsə kafir deyir. Salehlərə ibadət edənlər, dua edib onlardan kömək diləyənlər, bu adamları Allahın haqqı sayılan ibadətlərdə və ilahilikdə Ona ortaq tutanlar, elm və iman əhli tərəfindən *(deyilən şərtlərə əsasən)* yekdilliklə kafir sayılır"[60].

Şeyx Süleyman ibn Suhman deyir:

32. "Müsəlmana kafir demək məsələsi haqqında demişdik ki, "Vahhabilər" müsəlmanlara kafir demirlər. Şeyx Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* kiməsə kafir deməkdən çəkinər və ehtiyat edərdi. Hətta o, dinini öyrənməsi üçün özünə yol göstərən və ona hüccət çatdıran (hansı ki, bu hüccətə qarşı çıxan kafir olar) bir insanın olmadığı halda cahilliyindən Allahdan başqasından, qəbirlərdən və sairədən kömək diləyənlərin kafir olmasını deməkdə ehtiyat etmişdir. O, yazdığı məktubların bəzisində deyir: Biz, cahilliyi və bixəbər olması ucbatından kəvvazın qübbəsinə ibadət edənlərə kafir demirik. Şeyx təkid edərək deyir ki, kim, hüccət çatandan və onu öyrənmək üçün imkanı olandan sonra qəbirlərə ibadət edərsə, o kafir olur"[61].

Şeyx Məhəmməd ibn Əbdülvahhab, onun nəvələri və tələbələrinin məktublarında bu haqda saysız-hesabsız sözlər mövcuddur. Bizim məqsədimiz bütün bu sözləri cəm etmək deyil, sadəcə olaraq əməllərində şirkə yol verib, inadkarlıqla şirklərində israr edənlərə kafir hökmünün verilməsi üçün şəriət dəlilləri ilə hüccətin çatdırılımasının vacibliyini vurğulamaqdır. Həmçinin hüccət çatdırmaqla bərabər, qarşı tərəfin şübhələrini də dəf etmək lazımdır. Əməllərində şirkə yol verən avam insanların, onlara xəbərdarlıq edəcək bir kimsənin mövcudluğuna və hüccət çatdırılana qədər, üzürlü olması şəriətdə öz təsdiqini tapmışdır. Allah daha yaxşı bilir!"[62]

[58] əl-Kəlimat ən-Nafiə Fil Mükaffirat əl-Vaqiə: Səh 17.
[59] Məcmu Rəsail vəl Məsail ən-Nədiyyə: 1, 246.
[60] Məcmuətur Rəsail vəl Məsail ən-Nədiyyə: 3, 5.
[61] əd-Diya əş-Şariq: səh, 372.
[62] əl-Cəhlu Bi Məsailil Etiqad və Hukmuhu kitabından (səh, 444) müxtəsər şəkildə nəql edilmişdir.

PDF...

Möhtərəm oxucu, dəvət imamlarının *(Allah onlara rəhmət etsin)* müəyyən insana hüccət çatdirmaq haqqinda sözlərini nəql etdikdən sonra, mübahisələrə səbəb olan digər bir məsələyə keçirik. Bu, "**Hüccəti başa düşmək**" mövzusudur. Yəni, hüccətin çatdırılması ilə bərabər onun başa düşülməsi vacibdirmi?

Bəziləri, dəvət imamlarının bir neçə sözlərindən hüccətin başa düşülməsinin zəruri olmadığını anlamışlar. Amma bununla, həmin alimlərin məqsədləri səhv başa düşülüb. Əqidə və digər mövzularda həqiqətdən kənar düşmüş insanlara, sadəcə Quranı və hədisləri oxumaqla hüccətin çatmasını demək, bu alimlərin məqsədi deyildir. Buna dəlil, Şeyxülislam Məhəmməd ibn Əbdülvahhabın *(Allah ona rəhmət etsin)* bu sözləridir. O demişdir: "Biz, cahilliyi və bixəbər olması[63] ucbatından Əbdülqadirin, Əhməd əl-Bədəvinin və bu kimi qəbirlərin üzərində ucaldılan bütlərə ibadət edənlərə kafir demirik. Necə ola bilər ki, bizim torpaqlara hicrət *(köç)* etməyən, kiməsə kafir deməyən, döyüşlərdə iştirak etməyən Allaha şərik qoşmayan insanlara kafir deyək?! "**…Aman *(Allah)*! Bu, çox böyük bir böhtandır!...**"[64]

Digər bir məqamda isə demişdir: "Biz, şirkin batil olması haqqında hüccət çatdırdıqdan sonra yenə də uluhiyyətdə *(ibadətdə)* Allaha şərik qoşanları kafir sayırıq. Həmçinin insanları şirkə təşviq edənləri, yaxud onun icazəli olmasını isbatlamaq üçün batil şübhələr gətirənləri, öz silahı ilə Allaha şərik qoşulan məbədlərin müdafiəsinə qalxanları, şirki inkar edənlərə qarşı döyüşənləri və tövhidi boğmağa çalışanları kafir sayırıq. Sığınacağımız yalnız Allahadır. Vəssalam!"[65]

Şeyx Süleyman ibn Suhman deyir:

"Müsəlmana kafir demək məsələsi haqqında demişdik ki, "Vahhabilər" müsəlmanlara kafir demirlər. Şeyx Məhəmməd ibn Əbdülvahhab *(Allah ona rəhmət etsin)* kiməsə kafir deməkdən çəkinər və ehtiyat edərdi. Hətta o, dinini öyrənməsi üçün özünə yol göstərən[66] və ona hüccət çatdıran (hansı ki, bu hüccətə qarşı çıxan kafir olar) bir insanın olmadığı halda cahilliyindən Allahdan başqasından, qəbirlərdən və sairədən kömək diləyənlərin kafir olmasını deməkdə ehtiyat etmişdir. O, yazdığı məktubların bəzisində deyir: Biz, cahilliyi və bixəbər olması ucbatından kəvvazın qübbəsinə ibadət edənlərə kafir demirik. Şeyx təkid

---

[63] Şeyx İbrahim ibn Amir ər-Ruheyli "Movqifi əhlissünnə vəl camaat min əhlil əhva vəl bidə" *(Əhli sünnə və camaatın bidət və nəfsi istəklərinə uyanlara münasibəti)* adlı kitabı 1/218-də deyir: "Bu kitabın bəzi nüsxələrində *(və adəmi mən yufəhhiməhum)* ***(onları başa salanların olmamasına görə)*** deyilir. *(Bax, Əbu Batinin nüsxəsi).* Bu məqamı Şeyx Saleh əl-Ətram və Şeyx Məhəmməd əd-Duveyş kitabın tədqiqatında qeyd etmişlər",

[64] ən-Nur: 16

[65] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 128

[66] Süleyman ibn Suhman *(Allah ona rəhmət etsin)* özünün kitabu Tənbih Zəvil Əlbab əs-Səlimə Anil Vuqui Fil-Əlfaz əl-Mubtədiətil Vaximə və Təbriətuş Şeyxeyn əl-İmameyn Min Təzvir Əhlil Kəzib vəl Meyn: Səh, 122-123 – də deyir: "Əgər şeyx cahilliyi və bixəbər olması ucbatından qəbirlərin üzərində inşa edilən bütlərə ibadət edənlərə qarşı belə münasibət bəsləyirsə, necə ola bilər ki, yer üzündə yaşayanların hamısını kafir saysın, onlara qarşı müharibə elan etsin, mallarını halal görsün?! Şeyxin hal-vəziyyətini və nəyə dəvət etdiyini dərk edən aqil insan belə bir halı təsəvvür edə bilərmi?! Heç bir halda şeyx, ümmətdən, hətta əhli sünnə və camaatdan ayrılıb özündən yeni bir fikir söyləməmişdir. Onun bu məsələ, yəni, ad və sifətlər tövhidi, əməllər və ibadətlər haqqında dedikləri bütün müsəlmanlar tərəfindən birmənalı olaraq təsdiq edilmişdir. Bu işdə yalnız onların yolundan və mənhəcindən çıxan, cəhmiyyələr, mötəzililər, qəbirlərə ifratcasına sitayiş edənlər müxalif olmuşlar. Şeyxin buyurduğu məsələlər bütün peyğəmbərlərin və səmavi kitabların dediyində öz əksini tapmışdır. Bunu, peyğəmbərlərin və səmavi kitabların göndəriliş məqsədini bilənlər dərk edirlər. Şeyx hüccətin layiqli formada çatdırılmasından sonra bu əsaslara görə kiməsə kafir hökmünü verir. O bu işdə siratəl müstəqim yolu ilə özündən əvvəlkilərin ardınca gedir. Heç də dinə bidət *(yenilik)* gətirməmişdir."

edərək deyir ki, kim, hüccət çatandan və onu öyrənmək üçün imkanı olandan sonra qəbirlərə ibadət edərsə, o kafir olur"[67].

Bu rəyi Şeyx Abdullah ibn Məhəmməd ibn Əbdülvahhab *(Allah onlara rəhmət etsin)* da dəstəkləyir. Belə ki, ona verilən sualın cavabında deyir:

"Allaha və rəsuluna iman gətirən insan, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* şəriəti barəsində cahilliyi üzündən əməldə və ya etiqadda küfr edərsə bu insan bizə görə kafir sayılmır. Biz belə bir insana şəriət dəlilləri ilə hüccət çatana qədər kafir demirik. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olar. Əgər ona hüccət çatdırılarsa və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* buyurduqları bəyan edilərsə və hüccət çatdıqdan sonra yenə də öz dediklərində israrlı olarsa o zaman kafir olar. Çünki küfr, bəzi hallarda Allahın kitabına və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* sünnəsinə müxalif çıxmaqla olur. Bu, bütün alimlər tərəfindən ümumi anlamda qəbul edilmiş bir qaydadır... Quran yetişən hər bir insana artıq Peyğəmbərlə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hüccət çatmışdır. Lakin cahil insana bunu çatdırmaq üçün onu öyrədən elm adamı lazımdır. Allah daha yaxşı bilir"[68].

(Gördüyünüz kimi burada da şeyx *(Allah ona rəhmət etsin)*, cahilliyi, müəyyən bir insanın kafir olduğunu deməyə bir maneə olaraq qeyd edir. Belə ki, o adam Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* gətirdiyi şəriəti bilənə və ona çatdırılana qədər cahilliyi ilə üzürlü sayılır).

(Həmçinin üçüncü başlıqda): "Tövhid əqidəsinə, İslamın beş əsasına və imanın altı şərtinə əməl edib dünyasını dəyişən insan haqqında soruşulmuşdur. Belə ki, *(ölmüş adamlardan)* kömək istəyən, onlara dua və təvəssül edən, əvvəldə deyilən iki hədisə[69] əsaslanaraq cahilliyi və ya axmaqlığı ucbatından Peyğəmbəri *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* öz duasında vasitəçi qoşub dua edən insanın hökmü nədir?

Cavab: "Biz ölmüş insandan kömək istəyənlər haqqında danışmışdıq. Bu əməllə, duada təvəssül etmək arasında olan fərqi də qeyd etmişdik. Demişdik ki, ölmüş insandan dua edib kömək istəmək, ehtiyacların ödənilməsini tələb etmək, qəm-kədərin aparılmasını diləmək Allah və rəsulunun haram buyurduğu böyük şirkdən sayılır. Bütün ilahi kitablar və Peyğəmbərlərin dəvəti bu kimi əməllərin haramlığını, belə əməl sahiblərinin kafir olmasını, onlardan uzaq olmağı və bu əməllərinə görə onlara qarşı çıxmağı birmənalı olaraq qəbul edir.

Lakin, fətərat vaxtı *(dini anlayışların zəiflədiyi vaxtlarda)* və cahilliyin çoxaldığı bir zamanda fərdi insan hüccət çatana qədər bununla kafir olmur. Belə ki, bu kimi insanalara şəriət dəlilləri açıqlanmalı, bu əməlin Allah və rəsulunun haram buyurduğu böyük şirkdən olduğu bildirilməlidir. Əgər ona hüccət çatarsa, Quran ayələri və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hədisləri ona çatdırılarsa, bundan sonra yenə də öz şirkində davam edərsə kafir olar. Amma cahillik üzündən, özünə bu haqda bir məlumat verilməyən insanın bu əməli küfrdür, lakin onun özünə isə hüccət çatdırılmadan önvə kafir hökmü verilmir. Ona hüccət çatandan sonra etdiyi şirk əməlində israrlı olarsa, Lə İləhə illəllah Muhəmmədən

[67] əd-Diya əş-Şariq Fi Raddi Şubuhat əl-Maziq əl-Mariq: səh, 372.
[68] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 239-240
[69] Bu hədislərin biri, kor kişinin hədisidir. Digəri isə Ərş haqqında olan hədisdir.

rəsuləllah kəlməsinə şəhadət verib, namaz qılıb, zəkat çıxarıb, imanın altı əsasına iman gətirsə də artıq kafir olar"[70].

Şeyx Əbdüllətif ibn Əbdürrəhman, Şeyxülislam İbn Teymiyyənin *(Allah ona rəhmət etsin)* bu sözünə əlavə edərək deyir): Şeyxülislam İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* deyir: "...Lakin son zamanlar bir çox insanlarda şəriət haqqında cəhalətin çoxalması, elmin azalması onlara bu əməllərə görə kafir deməyə imkan vermir. Onlara kafir demək üçün Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* şəriətini və ona müxalif olan fikirləri bəyan etmək lazımdır"[71].

Şeyxin bu sözlərindən sonra Əbdüllətif ibn Əbdürrəhman deyir: "Şeyximiz[72] ümmətin alimlərini örnək tutub, onların dediklərinə uyğun şəkildə bu əqidəni təsdiq etmiş və açıqlamışdır. O, hüccət çatdırmadan və dəlilləri isbat etmədən heç kəsə kafir deməmişdir. Hətta o, dinini öyrənməsi üçün özünə yol göstərən və ona hüccət çatdıran bir insanın olmadığı halda cahilliyi ucbatından qəbirlərdən kömək diləyənlərin kafir olmasını deməkdə ehtiyat etmişdir. İbn Teymiyyənin *(Allah ona rəhmət etsin)* dediyi ***"...Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) şəriətini və ona müxalif olan fikirləri bəyan etmək lazımdır"*** bu sözlərin məğzi də elə budur[73].

(Məcmuətur Rəsail ən-Nəcdiyyə kitabında *(cild 5, səh 638)* Məhəmməd Rəşid Riza, Şeyx Məhəmməd ibn Əbdülvahhabın sözündən bu sitatı gətirir. Orada deyilir: *"... Hüccətin çatması, həmin insanın hüccəti Allahın hidayət verdiyi və müvəffəq etdiyi müti kimsələrin başa düşdüyü kimi tam şəkildə anlaması mənasına gəlmir"*. Daha sonra Şeyx Məhəmməd Rəşid Riza kitabın haşiyəsində bu sözə açıqlama verərək deyir: "Şeyxin bu yerdə *(tam şəkildə anlaması)* sözünü qeyd etməsi onun bir çox məqamlarda ümumi mənada dediyi sözlər ətrafında yaranmış şübhələri açıqlayır. Bəzi Nəcd alimləri onun ümumi sözlərini əsas tutaraq deyirlər ki, təkcə quranın yetişməsi ilə insanlara hüccət çatır. Həmin insanların onu başa düşməsi heç bir əhəmiyyət kəsb etmir. Amma bu nə ağılla nə də Quranın bu ayəsi ilə uzlaşmır. Allah təala buyurur: "**Hər kəs özünə doğru yol aşkar olandan sonra Peyğəmbərdən üz döndərib möminlərdən qeyrisinin yoluna uyarsa ...**"[74]. Tədqiqatçı alimlər bu ayəyə əsasən deyirlər ki, dəvətin dəlilləri ilə başa düşülməsi hüccətin çatdırılması üçün bir şərtdir.

(Əziz oxucu! Hüccətin çatdırılması və onun başa düşülməsi haqqında sənə təqdim etdiyim bu sözlər dəvət imamlarının metodudur. Bu elə uzaq və yaxın keçmişdə yaşamış İbn Teymiyyə, İbn əl-Qeyyim və onlar kimi digər hədis alimlərinin də dəvət metodudur. İndi isə bu məsələ haqqında həmin alimlərin sözlərini sənə təqdim edirəm.)

Hədis elmində möminlərin əmiri olan Məhəmməd ibn İsmail əl-Buxari Səhih əsərinin "İstitabətul Murtəddin" adlı bölümündə belə bir fəsil qeyd edir: *"Bab qətlul xəvaric vəl mulhidin bədə iqamətil huccəti aleyhim..."* "Xəvariclərin və digər inadkarların *(mulhidlərin)* hüccət çatdırdıqdan sonra öldürülməsi və Quranın bu ayəsi: "**Allah bir tayfanı doğru yola yönəltdikdən sonra qorxub çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları *(haqq yolundan)* sapdırmaz!...**"[75] – haqqında fəsil."

Əl-Eyni adlı alim deyir: "Buxari bu ayə ilə demək istəyir ki, xəvariclərin və digər inadkarların *(mulhidlərin)* öldürülməsi, **onlara hüccət çatdırdıqdan və əsas götürdükləri**

[70] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 10, 273-274
[71] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 414. əs-Sual vəl İcabə: səh, 372
[72] Yəni, Məhəmməd ibn Əbdülvahhab
[73] Misbahuz Zalam: 324-325
[74] ən-Nisa: 115
[75] ət-Tövbə: 115

**dəlillərin batil olmasını isbat etdikdən sonra** vacib ola bilər. Buna dəlil isə deyilən ayədir. Çünki ayənin mənasına görə Allah, Öz bəndələrinə nəyi edib - etməmək haqqında xəbərdarlıq etmədən onları cəzalandırmaz"[76].

İmam Şafii *(Allah ona rəhmət etsin)* deyir: "Allah təalanın Öz kitabında dediyi və Peyğəmbərinin xəbər verdiyi ad və sifətləri vardır. Hüccət çatdıqdan sonra məxluqat içərisində heç kəsin bunu inkar etməyə haqqı yoxdur. Çünki bu, Quranda nazil olmuş, ədalətli rəvayətçilərin Peyğəmbərdən *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* nəql etdikləri səhih hədislərdə öz təsdiqini tapmışdır. Özünə hüccət çatandan sonra buna qarşı çıxan artıq kafir olar. Hüccət çatmadan öncə o cahilliyi ilə üzürlü sayılır. Çünki bu, əqli, nəzəri və ya fikrən dərk olunan bir elm deyildir. Bu haqda cahil olan heç bir kəsə kafir hökmü vermək olmaz. Bu yalnız hüccət çatdırdıqdan sonra mümkündür"[77].

İbn Qudamə əl-Məqdisi *(Allah ona rəhmət etsin)*, Allahın haram etdiyi bəzi əməlləri yozumlu düşüncələrə əsasən halal görən lakin bununla kafir olmayan bir neçə sələf haqqında danışdıqdan sonra deyir:

"Bu adamların vəziyyətində olanlara da belə münasibət bəslənir. Həmçinin hər hansı bir insana, barəsində cahil ola biləcəyi bir məsələyə görə kafir deyilməz. Yalnız, bunu *(yəni, əməlinin küfr olduğunu)* biləndən və şübhəsi dəf ediləndən sonra halal görərsə, o zaman kafir olar"[78].

Digər bir məqamda isə deyir: "Kim, İslamda yeni olduğundan, yaxud uzaq bir kənddə yaşadığından cahil olub, onun *(yəni, zəkatın)* vacibliyini inkar edərsə, həmin hökmün vacib olması ona öyrədilməlidir. Lakin ona kafir hökmü verilmir. Çünki o, üzürlüdür"[79].

Mövzu ilə əlaqədar, sünnənin səhih dəlillərindən bir neçə sənədlə Peyğəmbərdən *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* rəvayət olunmuş bu hədisi qeyd etmək olar. "Qiyamət günü dörd qism insan: kar, dəli, əldən düşmüş qoca və fətərat zamanında[80] yaşayanlar - Allaha irad tutacaqdır.

Kar insan deyəcəkdir: Ey Rəbbim, İslam dini gəldiyi anda mən kar idim.

Dəli insan deyəcəkdir: İslam dini gəldiyi vaxt uşaqlar məni peyinlə vururdular.

Əldən düşmüş qoca deyəcəkdir: İslam dini gəldiyi zaman mən ağlımı itirmişdim.

Fətərat vaxtı ölən isə deyəcəkdir: Ey Rəbbim, mənə, Sənin peyğəmbərin gəlməmişdir.

Allah təala bu dörd qism insanlardan Ona itaət edəcəkləri haqda əhd alır və sonra onlara oda girmələrini əmr edəcək bir elçi göndərir.

Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* buyurur: Canım əlində olan Allaha and olsun, əgər onlar oda daxil olsalar atəş onlar üçün bir nemətə və sərinliyə çevrilər. Oraya daxil olmayanlar isə məcburən oraya sürüklənər.

Daha sonra Əbu Hureyrə *(Allah ondan razı olsun)* dedi: İstəyirsiniz bu ayəni oxuyun. Allah təala buyurur: "**...Biz, peyğəmbər göndərməmiş *(heç bir ümmətə)* əzab vermərik!**"[81]

---

[76] Umdətul Qari: 19, 369
[77] Fəthul Bari: 12, 407. Məaricul Qəbul: 1, 329.
[78] İbn Qudamənin əl-Muğni kitabı: 10, 85-86.
[79] İbn Qudamənin əl-Muğni kitabı: 2, 435.
[80] Fətərat zamanı, yəni, zəmanəsində haqq din və göndərilən peyğəmbər haqqında tam məlumatsız olub, belə vəziyyətdə ölən bir insan. *(tərc.)*
[81] əl-İsra: 15.

PDF...

Bu hədis dəlalət edir ki, Allah təala Öz bəndələrinə yalnız şəriəti bəyan etdikdən və hüccəti çatdırdıqdan sonra cəza və əzab verir[82].

İbn əl-Ərəbi deyir: "Bu ümmətin cahilləri və xəta edənləri, insanın müşrik və ya kafir olmasına səbəb olan, hər hansı bir küfr və ya şirk edərlərsə, əmması qalmayan açıq-aşkar hüccət çatana qədər, onlar, cahillikləri və xətaları ilə üzürlü sayılırlar. Elə hüccət ki, onu eşidəndən sonra ona müxalif olan kafir olar. Belə ki, bundan sonra bütün İslam alimlərinin, qəti olaraq yekdilliklə İslam dininin önəmli əsaslarından saydıqları və hər bir sıravi müsəlmanın düşünüb araşdırmadan bu əməlin dinin əsaslarından olduğunu bildikləri bir işi inkar edən kimsə, kafir olar"[83].

(Şeyxülislam İbn Teymiyyə kiməsə kafir və ya fasiq demək haqqında danışdıqdan sonra deyir):

"Bu və buna bənzər cahil insanlara, fərdi şəkildə şəriət dəlilləri ilə hüccət çatdırılana qədər kafir demək olmaz. Məhz hüccət çatdıqdan sonra həmin insanların peyğəmbərlərə müxalif olduqları aşkar ediləcəkdir. Onların danışdıqları sözlərin küfr olması şübhə doğurmur. Lakin hər bir fərdi insanın kafir sayılması üçün qayda belədir. Bidətlərin birinin digərindən daha pis olması bir faktdır. Bəzi bidətçilərdə müşahidə olunan iman gücü, digərində müşahidə olunmur. Hüccət çatdırılana və həqiqət bəyan edilənə qədər, heç kəsin səhv edən müsəlmana kafir deməyə haqqı yoxdur. İman gətirdiyi yəqinliklə bəlli olan kimsənin imanı, şəkk etməklə getməz. Onun imanı, hüccət çatdıqdan və şübhəsi dəf edildikdən sonra gedər"[84].

(Şeyxülislam İbn Teymiyyə bidətçilərin və nəfsi istəklərinə uyanların arxasında namaz qılmağın hökmü haqqında danışarkən deyir):

"Həqiqətdə məsələ belədir: Ola bilər deyilən söz küfr olsun və belə bir söz deyən insanın ümumi ifadələrlə kafir olması deyilsin. Məsələn, "Kim belə deyərsə o kafirdir". Lakin bunu deyən fərdi insanın kafir olmasına hökm vermək olmaz. Bunun üçün ona hüccət çatdırılmalıdır. Elə bir hüccət ki, ona qarşı çıxan artıq kafir olar. Bu qayda Qurani Kərimin əzab vəd edən ayələrinə də aiddir. Belə ki, Allah təala buyurur: **"Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək və onlar *(qiyamətdə)* alovlu Cəhənnəmə girəcəklər."**[85] Bu və digər belə əzab vəd edən dəlillər haqdır. Lakin müəyyən bir insanın belə əzaba düçar olmasını demək olmaz. Ümumiyyətlə Qiblə əhli sayılan müəyyən bir insanın cəhənnəmlik olmasına şahidlik edilməz. Çünki ola bilər, onun barəsində əzabın haqq olmasına aid şərtlər tamamlanmasın, yaxud bu əzaba mane olan səbəblər olsun. Məsələn, bəlkə etdiyi əməlin haram olmasını eşitməyib, yaxud tutduğu haram işdən tövbə edib, ola bilər qazandığı böyük savablar etdiyi haram işin günahını yusun, həmçinin ola bilər başına gələn müsibətlər günahının bağışlanmasına səbəb olsun və ya Allahın razılıq verdiyi kimsə ona şəfaətçi olsun. Deyən insanı kafir edən sözlər də belədir. Ola bilər kiməsə haqqı bilməsi üçün şəriət dəlilləri yetişməyib, yaxud ola bilər dəlillər ona çatıb lakin onların mötəbərliyinə əmin olmayıb, bəlkə onları başa düşmək imkanı olmayıb və ya onun qarşısına qoyulan şübhələrə görə Allah təala onu üzürlü saysın. Haqqı axtarmaq üçün ictihad edib, səhv nəticəyə gələn hər bir möminin səhvi, Allah təala tərəfindən

---

[82] Bu haqda bəzi dəlil-sübutları Şeyx Xalid əl-Ənbərinin "Əl-hukmu biğayri mə ənzələllah" adlı kitabından oxuya bilərsiniz. Səh: 44.

[83] Təfsirul Qasimi: 5, 1307-1308.

[84] əl-Fətava: 12, 500-501.

[85] ən-Nisa: 10

bağışlanır. Bunun elmi və ya nəzəri məsələlərdə olmasının fərqi yoxdur. Bu Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* səhabələrinin və bütün İslam alimlərinin görüşüdür. Onlar, inkar baxımından əməlləri hissələrə bölməmişlər. Əsas əməlləri inkar edənin kafir, ikinci dərəcəli əməlləri inkar edənin isə kafir olmaması görüşünü dəstəkləmirlər"[86].

Şeyxülislam ibn Teymiyyə *(Allah ona rəhmət etsin)* digər bir məqamda deyir:

"Allaha və rəsuluna mütləq şəkildə iman gətirib lakin haqqı tanıması üçün yetərli elmə sahib olmamış bir insan küfr əməl edərsə, ona hüccət çatana qədər kafir hökmü vermək olmaz. Elə bir hüccət ki, ona qarşı çıxan artıq kafir olar. Çünki əksər insanlar Quranın açıqlamasında səhvə yol verir, Quran və sünnənin bir çox məqsədləri barəsində cahilliyə yol verirlər. Bu ümmət etdikləri xəta və unutqanlığa görə günah daşımırlar. Həqiqət bəyan edildikdən sonra kiməsə kafir hökmü verilə bilər"[87].

Yenə də, İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* deyir:

"... İstiğasə *(kömək istəmək)* iki məna daşıyır: Birinci, Peyğəmbərdən *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* ona layiq təqdirdə kömək istəməkdir. Heç bir müsəlman bu barədə ixtilaf etmir. Kim bu mənanı inkar edərsə, əgər inkar etdiyi məna İslamdan çıxaran bir məsələdirsə bununla o kafir olar, yaxud da səhv edib haqq yoldan azar. İkinci, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* inkar etdiyi istiğasəni isə inkar etmək vacibdir. Kim Allahın vahid haqqı sayılan bir işi başqasına nisbət edərsə o insan da, hüccət çatdırılandan sonra kafir olar. Elə hüccət ki, onu eşidəndən sonra onu tərk edən, kafir olar"[88].

(Şeyxülislam İbn Teymiyyə, Bəkriyə rədd cavabı yazarkən eynilə bu sözləri demişdir):

"Elə buna görə də elm və sünnə əhli özlərinə müxalif olanlara kafir demirdilər. Müxaliflərinin onlara kafir deməsinə baxmayaraq onlar yenə də müxaliflərinə bu hökmü vermirdilər. Çünki kiməsə kafir hökmü kəsmək şəriət qaydasıdır. Heç kəs bunu qarşılıq olaraq öz müxalifinə deyə bilməz. Sənə qarşı yalan danışana, sənin ailənlə zina edənə qarşılıq verərək, ona qarşı yalan danışmağa və ya ailəsi ilə zina etməyə haqqın yoxdur. Çünki yalan danışmaq və zina etmək Allahın haram buyurduğu bir haqqıdır. Eləcə də kiməsə kafir demək Allahın haqqıdır. Allah və rəsulunun kafir dediyi kimsələrdən başqasına kafir deməyə heç kəsin haqqı yoxdur. Həmçinin fərdi insanın kafir olmasını vurğulamaq və onun öldürülməsinin icazəli olması həmin insana peyğəmbərin şəriəti ilə hüccətin çatdırılmasından sonra ola bilər. Elə bir hüccət ki, ona qarşı çıxan kafir olar. Dinin hansısa bir sahəsində cahil olan insan bununla kafir olmaz. Belə ki, Qudamə ibn Məzun və dostlarından ibarət bir qrup səhabə və tabiinlər Qurani Kərimin əl-Maidə surəsindəki bu ayəni[89] yozumlu şəkildə başa düşərək içki içməyin halal olduğunu deyirdilər. Onlar ayədən elə başa düşürdülər ki, yaxşı işlər görən insana içki içmək halaldır. Ömər, Əli və digər səhabə alimlər yekdil olaraq belə bir fikrə gəldilər ki, bu insanlardan tövbə etmək tələb olunmalıdır. Əgər onlar düşdükləri şübhədən dolayı ilk əvvəl yenə də içkini halal görməkdə israr etsələr, haqq çatdırılana qədər onlara möhlət verilməlidir. Əgər bundan sonra yenə də

---

[86] əl-Fətava: 23, 345-346.

[87] İbn Teymiyyənin əl-Məsail əl-Maridiniyyə əsəri: səh, 66.

[88] əl-Fətava: 1, 112.

[89] Həminki ayə budur: **"İman gətirib yaxşı işlər görənlərə pis əməllərdən çəkinib iman gətirdikləri, saleh əməllər etdikləri, sonra pis əməllərdən çəkinib iman gətirdikləri, sonra yenə də pis əməllərdən çəkinib yaxşı işlər gördükləri təqdirdə, daddıqları şeylərdən ötrü günah tutulmaz. Allah yaxşı iş görənləri sevər!"** *(əl-Maidə: 93)*.

inkar etsələr o zaman artıq kafir olarlar. İki səhih kitabda öz əhl-əyalına öləndən sonra yandırılıb külünün göyə sovrulmasını əmr edən insanın hədisi qeyd edilmişdir.

Hədisdəki insanın etiqadına görə dediyinin icrasından sonra Allah təala onu bir daha yenidən diriltmək iqtidarında deyil, bir daha onu dirildə bilməyəcəkdir. Yaxud o adam bu etiqadının icazəli olduğunu düşünmüşdür. Hər iki hal küfrdür. Lakin bu insan cahil idi. Bu insana, müxalif olacağı təqdirdə kafir sayılacaq, yetərli haqq çatmamışdı. Buna görə də Allah təala onu bağışladı. Ona görə mən, Allahın Ərşi üzərində olduğunu inkar edən hüluliyyə əqidəsini daşıyan cəhmiyyəlilərin fitnəsi baş verən zamanlar onlara deyirdim: Əgər mən sizin dediklərinizlə razılaşsam kafir olaram. Çünki mən, sizin bu sözünüzün küfr olduğunu bilirəm. Amma mənə görə siz kafir sayılmırsınız. Çünki, siz cahilsiniz. Bu xitab, onların alimlərinə, qazilərinə, şeyxlərinə və əmirlərinə deyilən bir xitab idi"[90].

Şeyxülislam İbn Teymiyyə, deyir:

"Ola bilər əksər insanlar, peyğəmbərlərin gətirdikləri bir çox elmlərin unudulduğu zaman və məkanda yaşasınlar. Hətta bu yerlərdə, Allahın Öz Peyğəmbərinə göndərdiyi kitabı və hikməti *(şəriəti)* təbliğ edəcək bir insan da qalmaya bilər. Bunun nəticəsində həmin insan, Allahın Öz Peyğəmbərinə göndərdiyi kitab və hikmət *(şəriətin)* haqqında çox bilməsin və onu öyrədəcək bir insan da olmasın. Bu kimi insanlar bununla kafir olmurlar. Ona görə alimlər yekdilliklə vurğulayırlar ki, kim elm və iman əhlindən uzaq olan bir kənddə böyüməsi, yaxud İslamda yeni olması səbəbi ilə şəriətin əsaslı dəlilləri ilə təsdiq edilmiş hansısa bir hökmünü[91] inkar edərsə, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* bu haqda buyurduğunu ona çatdırana qədər, ona kafir hökmü verilmir"[92].

İbn Teymiyyədən *(Allah ona rəhmət etsin)*, *(onun vaxtında)* üzlərini qırxmaqla tanınan Qələndəriyyə firqəsi haqqında soruşurlar: Onlar kimlərdir? Hansı təriqətdən sayılırlar? Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)*, onların şeyxsi Qələndərə üzüm yedizdirməsi və onunla qeyri ərəb dilində danışması haqqında olan etiqadlarına nə deyə bilərsiniz?

Cavabında deyir: "Üzlərini qırxmaqla tanınan Qələndəriyyəlilər yolunu azmışlardan və cahillərdəndir. Onların əksəriyyəti Allaha və rəsuluna qaşı küfr edənlərdir. Onlar namazın, orucun vacibliyini qəbul etmir, Allah və rəsulunun haram buyurduqlarını haram saymır, haqq dinə itaət etmirlər. Onların əksəriyyəti yəhudi və xaçpərəstlərdən daha kafirdirlər. Onlar nə müsəlman nə də zimmi sayılmırlar. Ola bilər onların arasında, yolunu azmış bidətçi, pis əməllərə uyan fasiq müsəlmanlar da olsun. Qələndərin, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* vaxtında olduğunu deyən, yalançı və iftiraçıdır. Şeyx Əbu Hafs əs-Səhrurdinin Əvarif adlı əsərində dediyinə əsasən, bu insanlar, farsların ibadətkar təbəqəsi olublar. Belə ki, onlar, fərz əməlləri edib haramlardan çəkindikdən sonra, öz nəfslərinə rahatlıq axtarardılar. Daha sonra onlar vacibləri tərk edib, haramları etməyə başladılar. Onlar bu işdə, etdikləri yaxşı işləri gizlədən, özlərini əməlisalehlər kimi göstərməmək üçün varlılar kimi geyinib, başlarına əmmamə qoyan və bu niyyətlərinə görə savab qazandıqlarını iddia edən "əl-Mələmiyyə" adlı təriqətə daha çox bənzəyirlər. Bundan sonra bir qrup insanlar peyda olub, şəriətin bəyənmədiyi işlərə əl qoydular. Sonralar bu iş daha da böyüdü.

---

[90] ər-Rədd Aləl Bəkri: səh, 258-260. Misir, Sələfiyyə çapı.

[91] Məsələn, beş vaxt namazı, Ramazan ayının orucunu, Beytül-Həramı həcc etməyi və s. İbn Teymiyyənin *(Allah ona rəhmət etsin)* bu sözlərini Fətava kitabının 11-ci cild, 407-ci səhifədən əvvəldə qeyd edilən sualın əvvəlində oxuya bilərsiniz.

[92] Məcmu əl-Fətava: 11, 407.

Belə ki, bir qrup insanlar haram işlər görür, fərz və vacib əməlləri tərk edirdilər. Bununla onlar özlərinin Mələmiyyə olduqlarını iddia edirdilər. Bu kimi insanlar, haqlı olaraq qınaq obyektinə çevrilmiş, tənqid olunmuş, dünya və axirətdə Allahın əzabına layiq görülmüşlər. Onların hamısını cəzalandırmaq və lənətlənmiş bu adətlərinin icrasına qadağa qoymaq lazımdır. Bidətini və günah işlərini izhar edən hər bir insana qarşı belə davranılmalıdır.

Bu tək onlara aid deyil. Hər bir insan, istər ibadətkar, fəqih, abid, sufi, zahid, fəlsəfəçi, istərsə də kəlamçı və ya onlarla razılaşan rəhbərlər, varlılar, yazıçılar, mühasiblər, həkimlər, vəzifəli və sıravi insanlar olsun, bu, heç bir fərq etməz. Kimliyindən asılı olmayaraq, kim, Allahın Peyğəmbəri ilə göndərdiyi hidayət yolundan, haqq dindən çıxarsa, Allahın Peyğəmbərinin dili ilə çatdırdıqlarının hamısını təsdiq etməzsə, Allah və Rəsulunun haram etdiyini haram saymazsa, yaxud zahiri və daxili mahiyyətinə görə Allahın göndərdiyi dinə zidd olan bir dinə qulluq edərsə, məsələn, şeyxinin ona ruzi verdiyini, ona kömək etdiyini, doğru yola yönəltdiyini, onun üçün yağış yağdırdığını, ona kömək olduğunu etiqad edərsə, yaxud şeyxinə ibadət edərsə, dua edib ondan kömək istəyərsə, ona səcdə edərsə, yaxud birmənalı və ya hansısa cəhətə görə Allaha yaxınlaşdıran bir işdə şeyxini Peyğəmbərdən *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* üstün sayarsa, özünün və ya şeyxinin Peyğəmbərə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* itaət etməmək hüququna malik olduğunu etiqad edən bütün bunlara görə kafir olar. Etiqadını izhar etdiyi təqdirdə kafir, gizlətdikdə isə münafiq sayılarlar.

İndiki vaxtlarda bu kimi insanlar çoxalmış, elm və iman dəvətçiləri azalmış, əksər ölkələrdə şəriət haqqında məlumatların zəifləmişdir. Belə insanların əksəriyyəti haqqı tanımaq üçün şəriətdən və Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* mirasından kifayət qədər məlumata sahib deyillər. Heç onların çoxuna bu haqda məlumat çatmayıb. Fətərat[93] zaman və məkanlarında, insan onunla olan az bir imana görə savab qazanır. Belə yerlərdə, Allah təala, hüccət çatanlara bağışlamadığı günahları, hüccət çatmayanlara bağışlayır. Bu haqda məşhur bir hədisdə deyilir. "İnsanlar elə bir vaxtda yaşayacaqlar ki, onlar nə namaz, nə oruc, nə həcc, nə də ümrə tanıyacaqlar. Yalnız qoca kişi və qadınlar deyəcəklər, biz dədə-babamızın bu sözləri: Lə iləhə illəllah – dediklərini eşitmişik. Huzeyfə ibn əl-Yəmandan soruşurlar: Lə iləhə illəllah kəlməsi onlara nə fayda verəcəkdir? Cavabında deyir: Cəhənnəmdən çıxmalarına kömək olacaqdır"[94].

Məsələnin sirri belədir. Kitab, sünnə və alimlərin yekdil rəyinə *(icmasına)* əsasən küfr sayılan bir sözün ümumi mənada küfr olduğu deyilir. Şəriətin başqa dəlilləri də buna dəlalət edir. İman, Allah və rəsulunun dediklərinə əsaslanan bir hökmdür. Bu, insanların öz zənnləri və nəfsi istəkləri ilə hökm edəcəkləri bir iş deyildir. Həmin sözləri deyən hər bir insanın kafir olduğunu demək zəruri deyildir. Bunun üçün o adama kafir deməyə əsas verən şərtlər olmalı və bu hökmə maneə törədən amillər dəf edilməlidir. İslamda yeni olduğundan, yaxud uzaq kənddə böyüdüyündən dolayı və ya bir söz eşidib onun Qurandan və ya Peyğəmbərin hədislərindən olduğunu bilmədən inkar edərək, içkinin və ya sələmçiliyin halal olduğunu deyən insanı bu haqda misal çəkmək olar. Eləcə də bəzi sələflər Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* hansısa məsələ haqqında dediklərini eşidənə qədər onu inkar edirdilər. Həmçinin səhabələr, Peyğəmbərdən *(Ona və ailəsinə Allahın salavatı və salamı*

---

[93] Fətərat zamanı, yəni, zəmanəsində haqq din və göndərilən peyğəmbər haqqında tam məlumatsız olub, belə vəziyyətdə ölən bir insan. *(tərc.)*

[94] Bu hədis haqqında, əs-Silsilətus Səhihə əsərinin 87-ci səhifəsində ətraflı məlumat qeyd edilmişdir.

*olsun)* soruşana qədər, Allahı görmək və s. bəzi məsələlərdə şübhə edirdilər. Həmçinin öz əhl-əyalına, öləndən sonra yandırılıb külünün göyə sovrulmasını əmr edən insanın[95] dedikləri də buna bir misaldır. Bu insanlar, şəriət ilə hüccət çatana qədər kafir sayılmırlar. Bu haqda Allah təala buyurur: "...daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın..."[96] Allah təala bu ümmətin unutduqları və yanıldıqları işləri bağışlamışdır"[97].

İbn əl-Qeyyim (Allah ona rəhmət etsin) deyir:

"Əzab iki səbəbə görə hasil olur.

Birinci: Hüccətdən üz çevirmək, onu istəməmək və onun tələbinə uyğun əməl etməmək.

İkinci: Hüccət çatandan sonra inadkarlıq etmək və onun tələbinə cavab verməmək. Birinci üz çevirmək, ikinci isə inadkarlıq küfrüdür.

Hüccət çatmadan və hüccəti öyrənmək imkanı olmadan edilən cahillik küfrünə görə əzab verilməsi Allah təala tərəfindən qəbul edilməmişdir"[98].

Digər bir məqamda İbn əl-Qeyyim *(Allah ona rəhmət etsin)* deyir:

"Hüccətin çatdırılması zamana, məkana və insanlara görə dəyişir. Kafirlərə, Allahın hüccəti vaxta və məkana görə bəzən çatar bəzən isə çatmaz. Həmçinin fərdi insanlar da belədir. Ola bilər hüccət hamıya deyil, bəzi insanlara yetişsin. Buna səbəb həmin insanın əqlinin və seçim qabiliyyətinin olmamasıdır. Məsələn, dəli və körpə uşaq kimi. Yaxud ola bilər danışılan sözü başa düşməsin və onun başa salmaq üçün tərcüməçi də olmasın. Belə insan, kar və heç nə başa düşməyən adamın hökmündədir. Bu insan da, Qiyamət günü Allaha irad tutan dörd qism insanlardan biridir"[99].

(İbn əl-Qeyyim *(Allah ona rəhmət etsin)* "Miftəhu Darus Səadət" adlı kitabının, "Əl-Muridun Aniz Zikr" adlı fəslində deyir):

"Belə bir sual olsa: Özünün haqq yolda olduğunu düşünən, amma əslində yolunu azmış bir insan üzürlü sayılırmı. Belə ki, Allah təala buyurur: "...onlar isə özlərinin haqq yolda olduqlarını güman edərlər!"[100] Sualın cavabı belədir: Belə zəlalət yolçularına üzür yoxdur. Çünki onların haqq yoldan azmasına səbəb, Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* gətirdiyi vəhydən üz çevirmələridir. Hətta o, özünün haqq yolda olduğunu güman etsə belə, yenə haqq çağırışçısının itaətindən boyun qaçırmaqla təqsirkar sayılır. Çünki o, özünün səhlənkarlığı və inadkarlığı ucbatından yolunu azmışdır. Haqq çatmayan və ona nail olmaq üçün imkanı olmayan bir insanın haqq yoldan azması hökm baxımından əvvəlkindən fərqlidir. Quranda vəd olunan cəza, birinci qism insanlara aiddir. İkinci qism insanlara gəldikdə isə deyə bilərik ki, Allah təalə hüccət çatdırmadan heç kəsə əzab verməyəcəkdir. Necə ki, O Özü bu haqda buyurur: "**...Biz, peyğəmbər göndərməmiş *(heç bir ümmətə)* əzab vermərik!**"[101] "**Biz peyğəmbərləri *(möminlərə)* müjdə gətirən və *(kafirləri)* əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha**

---

[95] Buxari: əl-Ənbiya, 3478. Müslim: Tövbə, 2757. Hər ikisi hədisi Əbu Səid əl-Xudridən rəvayət edirlər.

[96] ən-Nisa: 165.

[97] Məcmu əl-Fətava: 35, 165-166.

[98] Tariqul Hicrəteyn: səh, 414.

[99] Tariqul Hicrəteyn: səh, 414. Dörd nəfərin hədisi əvvəldə qeyd edilmişdir.

[100] əz-Zuxruf: 37

[101] əl-İsra: 15ş

**qarşı bir bəhanə yeri qalmasın..."**[102]**.** Həmçinin Allah təala cəhənnəmdəkilər haqda deyir: **"…Biz onlara zülm etmədik. Onlar** ***(günah işlər görməklə)*** **özləri özlərinə zülm edirdilər**[103]**"**[104].

İbn Qeyyim *(Allah ona rəhmət etsin)* başqa bir məqamda deyir:

"Hüccətin necə çatdırılması, vaxtdan vaxta, məkandan məkana fərqlənir. Elmin geniş vüsət aldığı vaxtlarda insanlara çatan hüccət, elmin zəiflədiyi müddətdə çatan hüccətdən fərqlənir. Şəhərlərdə yaşayanlara çatan hüccətlə, elmdən və elm adamlarından uzaq düşmüş kənd adamlarına çatan hüccət arasında fərq vardır. Həmçinin hüccətin çatması, insanın elmi və fitri qabiliyyətinə görə insandan insana fərqlənir. Bütün bunlar nəzərə alınmalıdır.

Hüccətin çatmasında məqsəd, həmin fərdi insanın eşitdiyi hüccəti başa düşməsidir. O, hüccəti elə başa düşməlidir ki, özünün bu hüccətə müxalif olub-olmadığını anlasın və belə hüccətə müxalif olmaqla kafir olduğunu bilsin. Onun bunu tam dəqiq şəkildə, elm və iman əhlinin anladıqları kimi, başa düşməsi şərt deyil. Həmçinin onun, hüccəti başa düşməsini təsdiqləməsi gərək deyildir. Bu, hüccəti çatdıran insanın, qarşısındakının hüccəti başa düşüb düşməməsi haqda verdiyi qiymətdən asılıdır. Çünki küfr və nifaq əhlinin əksəriyyəti hüccəti başa düşdükdən və bu haqda bildikdən sonra onu inkar edirlər. Necə ki, Allah təala Fironun tayfası haqda bu ayəni demişdir: **"*(Möcüzələrimizin)* həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər...** [105]**"** Daha doğrusunu Allah bilir!"[106]

İmam Zəhəbi *(Allah ona rəhmət etsin)* deyir: "Bilmədən və hüccət çatmadan heç kəs etdiyinə görə günah daşımır. Allah, lütf və mərhəmət sahibidir. Allah təala buyurur: **"…Biz, peyğəmbər göndərməmiş *(heç bir ümmətə)* əzab verməri̇k!"**[107] Dəyərli səhabələr *(Allah onlardan razı olsun)* Həbəşistanda olarkən, Peyğəmbərə *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* edilməsi vacib və ya haram olan əmrlər verilirdi. Həmin səhabələrə bu haqda xəbər, yalnız bir neçə aydan sonra yetişirdi. Onlara şəriət dəlilləri çatana qədər etdikləri işlərdə cahillikləri səbəbiylə üzürlü sayılırdılar. Bir insan, şəriət dəlillərini eşidənə qədər cahilliyi səbəbi ilə üzürlü sayılır. Daha doğrusunu Allah bilir!"[108]

Hədis alimi, Şeyx Hafiz Həkəmi *(Allah ona rəhmət etsin)* "Əlam əs-Sünnətil Mənşura" adlı kitabında belə bir sual ilə soruşulur: "Sahibini kafir edən bidətlər hansılardır?

Cavabında deyir: Belə bidətlər çoxdur. Bunun üçün qayda belədir: Kim, hamının yekdilliklə qəbul etdiyi, şəriət dəlilləri ilə tutarlı şəkildə təsdiqini tapmış, dinin zəruri amillərindən sayılan bir şeyi inkar edərsə kafir olar. Çünki bu, Quranı, peyğəmbərlərə Allah tərəfindən verilən şəriəti təkzib etməkdir. Buna cəhmiyyəlilərin, Allahın sifətlərini, İbrahim peyğəmbərin Allahın Xəlili olmasını, Allahın Musa ilə danışmasını və s. inkar edən bidətlərini misal çəkmək olar. Bu insanların bəzisi bu işdə məqsədinin, dinin əsaslarını məhv etmək və müsəlmanları şübhəyə salmaq olduğunu dərk edirdilər. Belələrinin kafir olması dəqiqdir. Əslində bu insan, dinin qatı düşməni və ona yad olan kimsədir. Qalanları

---

[102] ən-Nisa: 165.
[103] ən-Nəhl: 118.
[104] Miftəhu Darus Səadət; Tədqiqatçı, Əli ibn Həsən əl-Hələbi: 1, 208.
[105] ən-Nəml: 14.
[106] Tariqul Hicrəteyn: səh, 412-413.
[107] əl-İsra: 15ş
[108] əl-Kəbair: səh, 12.

isə aldanmış insanlardır. Belələrinə kafir hökmü vermək üçün, hüccət çatdırılmalı və ona əməl etməyə məcbur edilməlidirlər"[109].

(Şeyx Əbu Batinin, İbn Teymiyyənin *(Allah ona rəhmət etsin)*, hüccət çatdırana qədər müəyyən insana kafir deməyin qadağan olması haqda fətvasını nəql etməsi açıq-aşkar göstərir ki, Şeyx Əbu Batinin mənhəcinə görə də, müəyyən insana kafir demədən öncə hüccət çatdırılmalıdır[110]. O, deyir):

Şeyxülislam İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* deyir: "İslam dininin dəyişməz qaydalarına əsasən deyə bilərik ki, Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* öz ümmətinə nə peyğəmbərlər nə də başqa dirilərdən və ya ölülərdən istiğasə və ya başqa adla dua edib kömək diləməyi buyurmamışdır. Həmçinin ölüyə və ya ölü üçün səcdə etməyi və s. bu kimi əməlləri buyurmamışdır. Əksinə bizim bildiyimiz qədər Peyğəmbər *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* bütün bu kimi əməlləri qadağan etmişdir. Bütün bunlar Allah və rəsulunun haram buyurduğu şirk əməllərdir. Lakin son zamanlar bir çox insanlarda şəriət haqqında cəhalətin çoxalması və elmin azalması onlara bu əməllərə görə kafir deməyə imkan vermir. Onlara kafir demək üçün Peyğəmbərin *(Ona və ailəsinə Allahın salavatı və salamı olsun)* şəriətini və ona müxalif olan fikirləri bəyan etmək lazımdır. *(İbn Teymiyyə daha sonra deyir:)* Ona görə mən bu məsələni dinin əsaslarını bilən insanlara bəyan etdiyim zaman hamı buna diqqətlə nəzər salardı. Bu, İslam dininin əsasıdır. Bizim tərəfdarlarımız olan bəzi böyük şeyxlər deyirdilər: Bu sənin bizə açıqladığın ən önəmli məsələdir. Çünki onlar, bunu dinin əsası olaraq qəbul edirdilər."[111]

Şeyx Əbu Batin *(Allah ona rəhmət etsin)* bu sözlərə açıqlama verərək deyir:

"İbn Teymiyyənin *(Allah ona rəhmət etsin)* bu sözlərinin: *"Onlara kafir demək üçün Peyğəmbərin (Ona və ailəsinə Allahın salavatı və salamı olsun) şəriətini və ona müxalif olan fikirləri bəyan etmək lazımdır."* - mənası odur ki, bu insanlara fərdi şəkildə, *"filankəs kafirdir"* ifadəsi ilə, kafir demək mümkün deyil. Belə halda bu cür deyilir: Bu küfrdür. Kim bunu edərsə kafir olar. Həmçinin o, bir çox məqamlarda belə əməl sahiblərinin kafir olduqlarını ümumi ifadə demiş və bu kimi şirk əməllər edənlərin kafir olmaları haqda müsəlmanların yekdil rəyini qeyd etmişdir".

(Daha sonra şeyx Əbu Batin *(Allah ona rəhmət etsin)* İbn Teymiyyədən *(Allah ona rəhmət etsin)* iki sitat gətirir və iqrar edir ki, bir insana kafir deməyə əsas verən şərtlər olmadığı və bu hökmə maneə törədən amillər dəf edilməlidiyi təqdirdə, həmin adama kafir hökmü vermək vacib deyildir. Budur sitat):

"İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* bir neçə məqamda, eləcə də Qədərilər təriqəti barəsində soruşularkən belə cavab vermişdir: Məsələnin məğzi budur ki, Qurana, sünnəyə və alimlərin dediklərinə əsasən küfr olduğu vurğulanan sözlər, ümumi məna daşıyr. Buna şəriət dəlilləri də dəlalət edir. İman və küfr Allah və rəsulundan öyrənilən məsələlərdir. İnsanlar bu işdə zənnə əsaslanaraq hökm edə bilməzlər. Həmçinin, küfr söz işlədən bir insana kafir deməyə əsas verən şərtlər olmadığı və bu hökmə maneə törədən amillər dəf edilməlidiyi təqdirdə ona kafir adı vermək vacib deyildir. İslamda yeni olduğundan, yaxud

---

[109] Hafiz Həkəminin, Əlam əs-Sünnətil Mənşura Li-Etiqad ət-Taifə ən-Nəciyətil Mənsurah kitabı: səh, 219.

[110] Şeyx Abdullah ibn Əbdürrəhman Əbu Batin *(Allah ona rəhmət etsin)* başqa bir yerdə, yalnız gizli məsələlərdə, məsələn, ad və sifətlər və s. belə məsələlərdə hüccət çatdırmağın şərt olduğunu qeyd edir. Allaha şərik qoşanlara, qəbirlərə ibadət edənlərə isə hüccətin çatdırılmasını bir şərt olaraq qəbul etmədiyini deyir.

[111] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 414. əs-Sual vəl İcabə: səh, 372

PDF...
uzaq kənddə böyüdüyündən dolayı zinanın və ya içkinin halal olmasını deyən kimsəni buna misal çəkmək olar".

İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* bu məsələ haqqında danışarkən deyir: Məsələnin həqiqəti belədir ki, bir söz küfr olar bilər və bu sözü deyən insanın ümumi mənada kafir olması, *"kim belə deyərsə o kafirdir"* ifadəsi ilə qeyd olunar. Lakin bu kimi küfr sözləri işlədən fərdi insana, qarşı çıxacağı təqdirdə onu kafir edəcək hüccət çatdırılana qədər, ona kafir hökmü verilməz. Belə ümumi mənalı sözlərə Quranın əzab vəd olunan ayələrində rastlamaq mümkündür. Belə ki, Allah təala buyurur: "**Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çeviriləcək və onlar** *(qiyamətdə)* **alovlu Cəhənnəmə girəcəklər**"[112]. Əzav vəd olunan bu və digər ayələr haqdır. Lakin fərdi insanın əzaba düçar olacağını isə demək olmaz. Biz qiblə əhlindən olan fərdi insanların cəhənnəm əzabına düçar olacağına indidən şahidlik etmirik. Çünki ola bilər o insana müəyyən səbəblərə görə əzab verilməsin. Məsələn, ola bilər ona əzab verilməsi üçün hansısa şərt tamamlanmasın, yaxud bir maneə olsun, gördüyü işin haram olduğunu eşitməsin, etdiyi haram işdən tövbə etsin, etdiyi günahları siləcək savab işləri üstünlük təşkil etsin və ya başına gələn müsibət günahlarının bağışlanmasına səbəb olsun"[113].

**Faydalı məlumat:**

(Məhəmməd Rəşid Rza, Şeyx Əbu Batinin hüccətin çatdırılması ilə başa düşülməsinin fərqi haqqında bu sözləri qeyd edir):

"Bu məsələnin əmması var. Bu haqda Nəcd vilayətinin müasir böyük alimləri, Məkkə şəhərinin başçısı İmam Əbdüləziz ibn Feysəl Ali Səudun məclisində ixtilaf etmişlər. Bu məclisdə, şeyx Abdullah ibn Buleyhid, hüccətin başa düşülməsinin gərəkli olması fikrini dəstəkləmiş, hüccətin başa düşülmədən çatdırılmasının yetərli olmadığını irəli sürərək, rəy üstünlüyü ilə qalib çıxmışdı. O, bu haqda onlara tədqiqatçı alim İbn əl-Qeyyimin sözündən sitat gətirmiş və məclisdəkilər də bu fikirlə qane olmuşdular"[114].

**Şeyx Məhəmməd ibn Saleh əl-Useymin** ***(Allah ona rəhmət etsin)*** **belə bir sual ilə soruşuldu: Tövhidlə bağlı məsələlərdə cəhalət, insan üçün üzrdürmü?**

**Cavab:** Qulu öz Rəbbi ilə bağlayan hər məsələdə cəhalətin üzrlü olması təsbit edilmişdir. Allah sübhənahu və taala buyurur ki, ***"Biz Nuha və ondan sonrakı Peyğəmbərlərə vəhy***

---

[112] ən-Nisa: 10.

[113] əd-Durər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 12, 87-89.

[114] Məcmuətur Rəsail vəl Məsail ən-Nəcdiyyə: 4, ikinci bölüm, səh, 515. Yəqin ki, İbn Buleyhidin, İbn əl-Qeyyimdən nəql etdiyi sitat budur: "Hüccətin necə çatdırılması, vaxtdan vaxta, məkandan məkana fərqlənir. Elmin geniş vüsət aldığı vaxtlarda insanlara çatan hüccət, elmin zəiflədiyi müddətdə çatan hüccətdən fərqlənir. Şəhərlərdə yaşayanlara çatan hüccətlə, elmdən və elm adamlarından uzaq düşmüş kənd adamlarına çatan hüccət arasında fərq vardır. Həmçinin hüccətin çatması, eşidənin elmi və fitri qabiliyyətinə görə insandan insana fərqlənir. Bütün bunlar nəzərə alınmalıdır.

Hüccətin çatmasında məqsəd, həmin fərdi insanın eşitdiyi hüccəti başa düşməsidir. O, hüccəti elə başa düşməlidir ki, özünün bu hüccətə müxalif olub-olmadığını anlasın və belə hüccətə müxalif olmaqla kafir olduğunu bilsin. Onun bunu tam dəqiq şəkildə, elm və iman əhlinin anladığı kimi, başa düşməsi şərt deyil. Həmçinin onun, hüccəti başa düşməsini təsdiqləməsi gərək deyildir. Bu, hüccəti çatdıran insanın, qarşısındakının hüccəti başa düşüb düşməməsi haqda verdiyi qiymətdən asılıdır. Çünki küfr və nifaq əhlinin əksəriyyəti hüccəti başa düşdükdən və bu haqda bildikdən sonra onu inkar edirlər. Necə ki, Allah təala Fironun tayfası haqda bu ayəni demişdir: "***(Möcüzələrimizin)*** **həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər...** " Daha doğrusunu Allah bilir!" (Tariqul Hicrəteyn: səh, 412-413).

***göndərdiyimiz kimi, sənə də vəhy göndərdik. Biz İbrahimə, İsmailə, İshaqa, Yəquba və onun övladlarına, İsaya, Əyyuba, Yunisa, Haruna və Süleymana da vəhy göndərdik. Biz Davuda da Zəburu verdik. Peyğəmbərlər (göndərdik). Onların bəzisinin əhvalatını bundan əvvəl sənə danışdıq, bəzisinin əhvalatını isə söyləmədik. Və Allah Musa ilə sözlə danışdı. "Biz Peyğəmbərləri müjdə gətirən və əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün Peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın"***[115]. Başqa bir ayədə Uca Allah buyurur: ***"Biz, Peyğəmbər göndərməmiş əzab vermərik!"***[116] Həmçinin, ***"Allah bir tayfanı doğru yola yönəltdikdən sonra qorxub çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları (haqq yolundan) sapdırmaz! Həqiqətən, Allah hər şeyi (olduğu kimi, layiqincə) biləndir!"***[117] Peyğəmbər *(Ona Allahın salavatı və salam olsun)* buyurur: ***"Canım əlində olana and olsun ki, bu ümmətdən olan hər hansı bir yahudi və ya xaçpərəst mənim gətirdiyim şəriətə iman gətirməsə, Cəhənnəm əhlindən olar"***[118]. Bu mənanı ifadə edən hədislər çoxdur. Kim cahil olarsa, öz cəhalətinə görə dinə aid bütün məsələlərdə üzrlü hesab olunar. Lakin bir şeyi də bilmək lazımdır ki, bəzi cahillər inadkarlıq nümayiş etdirirlər. Yəni, haqq ona çatdırılır o isə haqqı araşdırmır, itaət etmir. Əksinə, şeyxlərinin yoluna, o cümlədən onları təzim edənlərin və onlara tabe olanların yoluna uyur. Əslinə baxdıqda, həmin şəxs üzrlü hesab edilə bilməz. Çünki ən azından belə insana bir şübhə şəklində olsa da haqq gəlib çatmışdır. O, bunu araşdırıb haqqa nail ola bilər. İtaət etdiyi insanları təzim edənlər, Allah taalanın haqlarında buyurduğu kəslərə bənzəyərlər: ***"Biz atalarımızı bir din üzərində (bütpərəstlikdə) gördük və biz də onların ardınca getdik!"***[119] Sonrakı ayədə isə Allah taala buyurur: ***"Biz atalarımızı bir din üzərində gördük"***[120] Ən mühümü odur ki, haqq barədə eşitməyən, bundan bixəbər olan insan, cahilliklə üzürlüdür və bu cəhalətə görə ona günah yazılmır. Cəhalət üzrə əməl edən insana etdiyi əmələ görə hökm kəsilir. Əgər bu qism insan özünü müsəlmanlardan hesab edib "LƏ İLƏHƏ İLLƏLLAH MUHƏMMƏDƏN RƏSULƏLLAH" kəlməsinə *(Allahdan başqa ibadətə layiq ilahın olmadığına və Məhəmmədin Allahın elçisi olduğuna)* şahidlik edirsə o müsəlmanlardan sayılır. Özünü müsəlmanlardan hesab etməyən şəxs isə dünyada mənsub olduğu dinin hökmündədir. Axirətə gəldikdə, Qiyamət günü onun məsələsi fitrət əhlinin məsələsi kimi olacaq. Yəni, izzət və cəlal sahibi Allaha həvalə olunacaq. Ən doğru fikrə əsasən, onlar Allahın istədiyi şeylərlə imtahan olunacaqlar. Bu imtahanda Allahın dediyinə itaət edənlər Cənnətə, asi olanlar isə Cəhənnəmə daxil olacaqlar. Bir şeyi də bilmək lazımdır ki, bu gün yaşadığımız dövrdə yer üzərində ayaq basılan az torpaq tapılar ki, Peyğəmbərin *(Ona Allahın salavatı və salam olsun)* dəvəti ora çatdırılmasın. Kütləvi informasiya vasitələrinin çoxluğu və insanların bir-birinə qarışaraq sıx münasibət qurmaları bunu deməyə bizə əsas verir. Deməli, əksər hallarda insanların küfrə getmələri onların inadkarlıqları səbəbilə yaranır"[121].

**Şeyx Məhəmməd ibn Saleh əl-Useymin** ***(Allah ona rəhmət etsin)*** **"Şərhu Kəşfuş Şubuhat" kitabında, Şeyxülislam İbn Teymiyyənin və Məhəmməd ibn Əbdülvahhabın** ***(Allah onların***

[115] (ən-Nisa, 163-165).
[116] (əl-İsra, 15).
[117] (ət-Tövbə, 115).
[118] "Səhih Müslim" 153;
[119] (əz-Zuxruf, 22).
[120] (əz-Zuxruf, 23).
[121] İbn Useyminin, fətavalar və risalələr toplusu kitabı: cild, 3, səh, 5-6.

*hər ikisinə rəhmət etsin)* **müəyyən insana hüccət çatdırmaq barədə sözünü nəql etdikdən sonra deyir:**

"Xülasə, cahil insan dediyi və ya etdiyi fasiqliyə görə üzürlü sayıldığı kimi, dediyi və ya etdiyi küfrə görə də üzürlü sayılır. Bu haqda, Qurandan, sünnədən, məntiqdən və alimlərin sözlərindən dəlillər gətrimək olar".

Həmçinin bu sözlərdən əvvəl səhifə 62-də deyir:

"Kiməsə kafir hökmü vermədən öncə, iki əsasa diqqət yetirmək lazımdır.

**Birinci:** Bu əməlin insanı kafir etməsi haqda Quran və sünnənin dəlaləti olmalıdır ki, bu işdə hökm edən insan, Allahın adından yalan uydurmasın.

**İkinci:** Hökmün müəyyən insana uyğun gəlməsi lazımdır. Yəni, onun barəsində təkfirin şərtləri uyğun gəlməli və buna mane olan amillər olmamalıdır".

"Xülasə, cahilliyin üzürlü olması haqda deyilən dəlillər ümumi və əhatəlidir. Quran ayələrinin ümumiliyi və sünnə dəlillərinin təfsilatı bunu təsdiq edir. Başda, Şeyxülislam İbn Teymiyyə, İbn əl-Qeyyim, Məhəmməd ibn Əbdülvahhab və digər dəvət imamları olmaqla, bütün Əhli Sünnə alimlərinin başa düşdükləri və öz əsərlərində təsdiq etdikləri etiqad, budur. Bu məsələdə onların dediklərinin xülasəsi odur ki, İslamda yeni olan, yaxud uzaq kənddə böyüyən və buna bənzər yerlərdə, şirkin geniş yayıldığı, tövhid dəvətçilərinin azlıq təşkil etdiyi bir cəmiyyətdə böyüyən insanlar Allaha etiqad etdikləri bütün məsələlərdə cahilliklərindən dolayı üzürlü sayılırlar. Belə insanlar, yalnız hüccət çatdıqdan sonra kafir olarlar. Elə bir hüccət ki, ona müxalif olan artıq kafir olar"[122].

Yazımın sonunda özümə və elm tələb edən qardaşlarıma tövsiyəm budur ki, hər bir məsələdə, ələlxüsus iman və küfr məsələlərində, elm və iman adamlarına müraciət etsinlər. Çünki bu məsələlər İslam ümmətinin tarix boyu qarşılaşdığı ən təhlükəli məsələlərdəndir. Şeyxülislam İbn Teymiyyə *(Allah ona rəhmət etsin)* deyir:

"Elm, ədalət və rəhmət, sünnə və camaat alimlərində, elm və iman adamlarındadır. Onlar, sünnəyə uyğun gələn haqqı bilən, bidətlərdən uzaq olan kimsələrdir. Haqq yoldan çıxanlara, özlərinə zülm edənlərə qarşı ədalətli davranırlar. Bu xüsusda Allah təala buyurur: **"Ey iman gətirənlər! Allah qarşısında *(borcunuzu yerinə yetirməkdə)* sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır..."**[123] Onlar, insanlara qarşı rəhmli olar, onlar üçün xeyir, doğru yol və elm istəyərlər. Onlar, insanlara dərhal pislik etməzlər. İnsanların səhvlərini, cahilliklərini və zülmlərini aşkar etməkdə məqsədləri haqqı onlara çatdırmaq, məxluqata mərhəmət bəsləmək, yaxşı işləri əmr edib, pis işlərdən çəkindirmək, hamı tərəfindən Allahın dininin yaşadılmasına nail olmaq və Allahın adını uca tutmaqdır"[124].

Son söz olaraq, Şeyxülislam Məhəmməd ibn Əbdülvahhabın oğlu Abdullahın dediyini deyirəm: "Biz zorakılıq və təəssübçülükdən xali olan ağıl, elm və insaf sahiblərinə xitab edirik. Sözü deyən adama yox, dediyi sözə baxmaq lazımdır."[125]

**Ey uca və nöqsansız Rəbbim!**

---

[122] əl-Cəhlu Biməsailil Etiqad və Hukmuhu: səh, 448.
[123] əl-Maidə: 8.
[124] ər-Rəddu Aləl Bəkri: Səh, 257.
[125] əd-Dürər əs-Səniyyə Fil Əcvibətin Nəcdiyyə: 1, 229-236

PDF...

**Sənin həmdi-sənan ilə, Səndən başqa ibadətə layiq haqq ilahın olmadığına şahidlik edirəm. Sənə tövbə edir və Səndən bağışlanma diləyirəm.**